**AZƏRBAYCAN RESPUBLİKASI**

---

**THE REPUBLIC OF AZERBAIJAN**

# ELMİ İŞ

**Beynəlxalq elmi jurnal**
**İmpakt Faktor: 2.717**

**Cild: 18 Sayı: 2**

# SCIENTIFIC WORK

**International scientific journal**
**Impact Factor: 2.717**

**Volume: 18 Issue: 2**

**Bakı – Baku**
**2024**

Jurnal 25.04.2007-ci ildə
Azərbaycan Respublikası
Ədliyyə Nazirliyi
Mətbu nəşrlərin
reyestrinə daxil edilmişdir.
Reyestr № 2212

The journal is included in the
register of Press editions of the
Ministry of Justice
of the Republic of Azerbaijan on
25.04.2007.
Registration № 2212

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti 529,
“Azərbaycan” nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat avenue 529,
“Azerbaijan” Publishing House,
6-th floor

**Tel.:** + 994 50 209 59 68
+ 994 55 209 59 68
+ 994 99 809 67 68
+ 994 12 510 63 99

**e-mail**
elmmerkezi@aem.az

## Beynəlxalq indekslər / International indices

**ISSN: 2663-4619**
**e-ISSN: 2708-986X**
**DOI: 10.36719**

## Mathematics and mechanical sciences



## Technical sciences

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/99/8-13

**Əlöysəd Əsgərov**
Azərbaycan Dövlət Aqrar Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
alovsad.asgarov@mail.ru
**Bəsti Novruzova**
Azərbaycan Dövlət Aqrar Universiteti
elekberlimehemmed@mail.ru

# AZƏRBAYCANDA KƏND TƏSƏRRÜFATI İNNOVASİYALARININ TƏTBİQİNİN STİMULLAŞDIRILMASI

**Xülasə**

Məqalədə müasir şəraitdə kənd təsərrüfatı innovasiyalarının rolu və əsas formaları, habelə aqrar sahədə innovasiya sistemlərinin formalaşması məsələlərinə baxılır, innovasiyaların tətbiqinin stimullaşdırılması istiqamətləri araşdırılır. İnnovasiyaların stimullaşdırılmasına müasir yanaşmalar təhlil olunur. Bununla əlaqədar innovasiya siyasətləri çərçivəsində həyata keçirilən tədbirlərin prioritet istiqamətlərinin seçilməsi və onların reallaşdırılması açıqlanır.

Eləcə də müasir şəraitdə Azərbaycanın kənd təsərrüfatında innovasiyaların tətbiqi üzrə irəliləyişlər, habelə bu sahədə həyata keçirilən stimullaşdırma mexanizmlərinin formalaşması təhlil olunur. Məqalədə əsas istiqamətlər üzrə kənd təsərrüfatının innovativ inkişafının sürətləndirilməsi baxımından dövlət dəstəyi tədbirlərinin əhatə dairəsinin genişləndirilməsinə dair təkliflər verilir.

***Açar sözlər:*** *kənd təsərrüfatı, innovasiya, investisiya, səmərə, ekaloji tarazlıq, ərzaq təhlükəsizliyi, rəqabət qabiliyyətliliyi*

**Aloysad Asgarov**
Azerbaijan State Agrarian University
PhD in economics
alovsad.asgarov@mail.ru
**Basti Novruzova**
Azerbaijan State Agrarian University
elekberlimehemmed@mail.ru

## Stimulation of the application of agricultural innovations in Azerbaijan

**Abstract**

In the article, the role and main forms of agricultural innovations in modern conditions, as well as the formation of innovation systems in the agrarian field, are considered, directions for stimulating the application of innovations are examined. Modern approaches to innovation stimulation are analyzed. In this regard, the selection of the priority directions of the measures implemented within the framework of innovation policies and their implementation are explained. Also, in modern conditions, advances in the application of innovations in Azerbaijan's agriculture, as well as the formation of stimulation mechanisms implemented in this field, are analyzed. In the article, proposals are made for expanding the scope of state support measures in terms of accelerating the innovative development of agriculture in the main directions.

***Keywords:*** *agriculture, innovation, investment, efficiency, ecological balance, food security, competitiveness*

## Giriş

Müasir şəraitdə kənd təsərrüfatının dinamik inkişafının təmin edilməsi bu sahədə innovasiyaların mənimsənilməsi ilə bağlıdır. İnnovasiyalar iqtisadiyyatın aqrar sektorunda istehsalın texniki, texnoloji və təşkilati əsaslarının yeniləşməsi bazasında məhsuldarlığın artırılmasında, rəqabətqabiliyyətli məhsul istehsalının genişləndirilməsində başlıca rol oynayır. Kənd təsərrüfatının innovasiyalı inkişafı, həmçinin aqrar sahədə fəaliyyətlə bağlı dayanıqlı inkişaf məsələlərinin həllinə, ilk növbədə torpaq və su resurslarının qorunması və səmərəli istifadəsinə əlverişli imkanlar yaradır. Bu baxımdan kənd təsərrüfatında innovasiyaların geniş yayılması qlobal miqyasda ərzaq təhlükəsizliyinin təmin edilməsi ilə yanaşı həm də ekoloji tarazlığın gözlənilməsinin mühüm amilləri sırasına daxil edilir ("Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi", 2016: 92).

Kənd təsərrüfatı sahəsində innovasiyaların tətbiqi aqrar sektorun dinamik inkişafını şərtləndirən əsas amillərdən biri kimi çıxış edir. Aqrar innovasiyalar dayanıqlı inkişaf prinsiplərinin reallaşdırılması baxımından da mühüm rol oynayır.

Kənd təsərrüfatının innovativ inkişafı elm tutumludur və həm də böyük həcmdə investisiya tələb edən prosesdir. Bu baxımdan ölkə iqtisadiyyatının aqrar sektorunda innovasiya mühitinin yaradılması, innovativ texnika və texnologiyalara əlçatanlığın artırılması və yeni texnologiyalara adaptasiyanın sürətləndirilməsinə ehtiyac yaranır (2).

Eyni zamanda kənd təsərrüfatının innovativ inkişafının sürətləndirilməsi baxımından dövlət dəstəyi tədbirlərinin əhatə dairəsinin genişləndirilməsi məqsədəuyğundur. Müvafiq dünya təcrübəsi nəzərə alınmaqla bu sahədə həyata keçiriləcək tədbirlərin əsas istiqamətlərinə ilk növbədə aqroinnovasiya parklarının yaradılmasının və fəaliyyətinin dəstəklənməsi, NDVI texnologiyalarının tətbiqinin əhatə dairəsinin genişləndirilməsinin təşviqi, kənd təsərrüfatı məhsulları istehsalında əməliyyatların səmərəliliyini artıran innovativ texnologiyalardan istifadənin stimullaşdırılmasının gücləndirilməsi aid edilə bilər (3).

Aqrar sahədə tətbiq edilən hər bir innovasiya məhsuldarlığı, gəlirləri artırır və nəticə etibarı ilə bu sahənin daha sürətli inkişafını təmin edir. Son illər ərzində Azərbaycanın kənd təsərrüfatında bir sıra innovativ metod və üsullardan istifadə olunmağa başlamışdır. Kənd təsərrüfatında dronlardan istifadə, ağıllı bağ, müasir əkin metodları, zərərvericilərə qarşı müasir bioloji mübarizənin təşkili, biotexnologiya laboratoriyalarında virussuz toxum və ting yetişdirilməsi, əkin sahələrinin koordinatlarının və sahədə hansı məhsulun əkilməsinin satellitlər vasitəsilə müəyyənləşməsi və s. buna aid edilə bilər. Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi tərəfindən tətbiq edilən Elektron Kənd Təsərrüfatı İnformasiya Sistemində fermerlərin həyata keçirdikləri biznes fəaliyyətlərinin və kənd təsərrüfatı məhsullarının istehsalının ilkin mərhələsindən son mərhələsinə qədər bütün proseslər öz əksini tapacaqdır. Həmçinin bu sistem bir çox hədəflərə nail olmağa imkan yaradacaq. Bura aqrar sektorun dövlət tərəfindən dəstəklənməsində şəffaflığın və operativliyin artırılması, bütün istiqamətlər üzrə dövlət siyasətinin həyata keçirilməsinə innovativ dəstək, kənd təsərrüfatına yararlı torpaqların və digər təbii resursların idarə edilməsi və səmərəli istifadə edilməsinin təmin edilməsi, informasiya və məsləhət xidmətlərinin effektivliyinin yüksəldilməsi və s. aiddir. Aqrar sahə üzrə vahid məlumat bazasının yaradılması bu sahənin gələcək inkişafında və idarə olunmasında olduqca önəmli faktordur (Məmmədov, Zeynalov, 2007).

Kənd təsərrüfatı innovasiyası ayrı-ayrı təsərrüfat subyektlərinin və ya təşkilatların/qurumların fəaliyyət səmərəliliyini, rəqabət qabiliyyətini, şoklara davamlılığını və ya ekoloji dayanıqlılığını artıraraq ərzaq təhlükəsizliyinə, iqtisadi inkişafa və təbii ehtiyatların dayanıqlı idarə edilməsinə töhfə vermək üçün müəyyən kontekstdə yeni və ya mövcud məhsulların, proseslərin və ya təşkilati üsulların ilk dəfə istifadəyə verilməsi prosesidir (Məmmədov, Zeynalov, 2007).

Kənd təsərrüfatı innovasiyaları kənd təsərrüfatı istehsalı prosesində istifadə olunan yeni və ya təkmilləşdirilmiş resurs (input) və metodları əhatə edir. Nümunə olaraq yeni toxum növü, yeni gübrə növü və torpağa qulluqda yeni bir üsul göstərilə bilər. Bunlar hamısı istehsal və ya səmərəliliyi artıran amil və tətbiqlərdir. Kənd təsərrüfatı innovasiyası ümumiyyətlə kənd təsərrüfatı məhsullarının yetişdirilməsi, emalı, qablaşdırılması, paylanması və istehlakı və ya başqa şəkildə

istifadəsi ilə məşğul olan çoxsaylı iştirakçılar (aktyorlar) arasında dinamik qarşılıqlı təsir nəticəsində yaranır (Sadıqov, Hüseynov, Həsənov, 2012).

Kənd təsərrüfatı innovasiyası mövcud torpaq, su və biomüxtəliflik ehtiyatlarını tükəndirmədən kənd təsərrüfatı bitkilərinin məhsuldarlığını və adaptasiyasını artırmaq, çeşidini şaxələndirmək, ərzaq məhsullarının qidalılıq dəyərini artırmaq, heyvanların populyasiyalarını artırmaq, becərmə üçün artan sənaye məhsulları və yanacaq ehtiyaclarını təmin etmək potensialına malikdir (Məmmədov, Zeynalov, 2007).

Kənd təsərrüfatı sahəsi mövcud torpaq və su resurslarını, o cümlədən bioloji müxtəlifliyi qorumaq və iqlim dəyişikliyinə cavab vermək üçün təbii ehtiyatlardan daha davamlı şəkildə istifadə etməlidir. Bu çətinliklərin öhdəsindən gəlmək və imkanlara cavab vermək baxımından kənd təsərrüfatı sahəsinin davamlı şəkildə məhsuldarlığı artırması üçün innovativ yanaşmaları mənimsəməsi lazımdır. İnnovasiya yalnız texnoloji inkişafdan deyil, eyni zamanda fermerləri ehtiyac duyduqları məlumatlarla əlaqələndirməyin yeni yollarından qaynaqlanır.

Kənd təsərrüfatında innovasiya məhsul istehsalından tutmuş, istehsal vasitələrinin idarəedilməsinə və bazara çıxışa qədər istehsal tsiklinin bütün mərhələlərini və bütün dəyər zəncirindəki prosesləri əhatə edir (Abbasov, 2005)

Bu sahələrin hər birində innovasiyanın tətbiqi vacibdir. Kiçik kapital tələb edən və ya qazancın qısa müddət ərzində əldə edilə biləcəyi sadə innovasiyalar böyük kapital və əmək sərfi tələb edən və qoyulmuş vəsaitin geri qaytarılması qeyri-müəyyən olan kompleks innovasiyalardan daha asan qəbul edilir (Məmmədov, 2021).

Kənd təsərrüfatının elektronlaşması - aqrar sahədə geniş rəqəmsal texnologiyalar və data tətbiqetmələri ilə ifadə olunan dördüncü inqilab hesab olunur.

Kənd Təsərrüfatı İnnovasiya Sistemi (AIS) davranış və fəaliyyətlərinə təsir göstərən qurumlar və siyasətlərlə birlikdə yeni məhsulların, yeni proseslərin və yeni təşkilat formalarının istifadəsinə yönəlmiş təşkilatlar, müəssisələr və fərdlər şəbəkəsidir (Məmmədov, 2021). Yəni fərqli agentlərin qarşılıqlı əlaqədə olması, məlumatları əldə etməsi, paylaşması, mübadilə etməsi və istifadə etməsi qaydalarıdır. AIS dörd əsas komponentdən ibarətdir: tədqiqat və təhsil, ticarət və müəssisələr, əlaqələndirici qurumlar (bridging institutions) və əlverişli mühit (Məmmədov, Zeynalov, 2007).

**AIS-in müəyyənedici xüsusiyyətləri aşağıdakı cədvəldə verilmişdir.**
**Cədvəl. Kənd təsərrüfatı innovasiya sisteminin müəyyənedici xüsusiyyətləri.**

| Müəyyənedici xüsusiyyətlər | Xüsusiyyətin məzmunu |
|---|---|
| Məqsəd | Kənd təsərrüfatı istehsalı və marketinq sistemi boyunca innovasiya etmə qabiliyyətinin gücləndirilməsi |
| İştirakçılar (aktyorlar) | Kənd təsərrüfatı istehsalı və marketinqi ilə əlaqəli hər cür biliklərin yaradılması, yayılması, uyğunlaşdırılması və istifadəsi ilə məşğul olan dövlət və özəl sektordakı potensial bütün iştirakçılar |
| Nəticə | İstehsal, marketinq, siyasət araşdırmaları və müəssisə sahələri boyunca texniki və institusional yeniliklərin kombinasiyası |
| Təşkilatçılıq prinsipi | Sosial və iqtisadi dəyişikliklər üçün biliyin yeni şəkildə istifadəsi |
| İnnovasiya mexanizmi | İnteraktiv öyrənmə |
| Potensialın gücləndirilməsinin keyfiyyəti | İştirakçılar (aktyorlar) arasında qarşılıqlı əlaqələrin gücləndirilməsi: qarşılıqlı əlaqəni, öyrənməyi və yeniliyi dəstəkləmək üçün institusional inkişaf və dəyişiklik; əlverişli bir mühit yaratmaq. |

Kənd təsərrüfatının inkişafının məzmunu dəyişdikcə innovasiyanın nəyi təşkil etdiyinə dair fikirlər dəyişmiş və buna müvafiq olaraq investisiya qoymaq üçün yanaşmalar da dəyişmişdir. Kənd təsərrüfatının inkişafı kontekstində "tədqiqat potensialı"nı ("research capacity") yaradan fikirlər yenilik etmək qabiliyyətinə investisiya qoyuluşu yanaşmaları ilə birlikdə inkişaf etmişdir (Məmmədov, 2021).

İnnovasiya siyasəti dövlətin innovasiya prosesinə (məhsul və proses innovasiyalarının inkişafı və tətbiqi) təsir edən yanaşmaları və tədbirlərinin toplusudur. Bu siyasətin başlıca məqsədi iqtisadi (iqtisadi artım, məhsuldarlıq artımı, məşğulluq və rəqabətlilik) olmaqla bərabər, mədəni, sosial, ekoloji məqsədlər də ola bilər. Dövlət özünün innovasiya siyasəti ilə innovasiya prosesi və fəaliyyətlərinin tədqiqat infrastrukturu, investisiya, bazara çıxış və ticariləşmə, tənzimləyici mühit və texnologiya transferi aspektlərindəki problemlərin həllinə stimul verməlidir (Hüseynov, Novruzova, Əsgərov, 2017).

İnnovasiya kollektiv fəaliyyət və mütəşəkkil mühit tələb edir. Kənd təsərrüfatı və ya kənd yerlərinin inkişafı üçün innovasiya dəstəyi sahəsində iki düşüncə məktəbi önə çıxır. Birincisi innovasiya üçün əlverişli şərait yaratmağı hədəfləyən "asanlaşdırma"ya inanır. İkincisi ideya və layihələndirmə mərhələlərindən paylanmaya və yayılmaya (Raven) qədər tədricən uyğunlaşdırılmış dəstək təmin edərək yenilikçi iştirakçılar (aktyorlar) birliyini üzə çıxarmağı və nəzarət etməyi əhatə edən strateji idarəetmə üzərində dayanır ("Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi", 2016: 92).

Kənd təsərrüfatı sektorundakı inkişaf üçün texniki investisiyalar və inkişaf uzunmüddətli böyümənin təmin edilməsində vacibdir. İnnovasiya sosial və iqtisadi inkişafı təmin edə biləcək ən vacib vasitələrdən biridir və istehsalda səmərəliliyi artırmaqla yanaşı, təbii qaynaqlardan da səmərəli istifadə edilməsi, xüsusən də ekoloji cəhətdən təmiz (environmentally friendly) olması başlıca şərtdir. Kənd təsərrüfatındakı innovasiyalar yalnız input-output əlaqəsini yaxşılaşdırmaq və təbii ehtiyatların istifadəsi ilə məhdudlaşmır. Dünyada dəyişən iqtisadi, siyasi və ekoloji şərtlərdən asılı olaraq innovasiya yolu ilə zəncirdəki işlənməmiş xammala dəyər qatmaq və istehsaldan sonra emal etmək, qablaşdırmaq, saxlamaq, nəql etmək, paylamaq və qida təhlükəsizliyini təmin etmək mümkündür. Nəticə olaraq kənd təsərrüfatında innovasiya yuxarıda göstərilən proseslərlə birlikdə istehsala təkan verərək böyüməni və inkişafı sürətləndirir (8)

İnnovasiyanı birbaşa və ya dolayı formada dəstəkləmək üçün bir sıra dövlət siyasət alətləri vasitəsi ilə həyata keçirilən innovasiya siyasəti inkişaf etməkdə olan və inkişaf etmiş ölkələrin inkişaf strategiyalarının mərkəzindədir. Siyasi qərarverənlər iqtisadiyyatı inkişaf etdirmək üçün getdikcə daha çox innovasiya siyasəti vasitələrindən istifadə edirlər. Bununla birlikdə xüsusilə inkişaf etməkdə olan ölkələr kontekstində innovasiya siyasətindən danışarkən nəyin özünü doğruldacağı barədə daha az fikir birliyi var (Kərimov, Babayev, 2007)

İnnovasiya parkları ilə biznes parkları arasındakı fərq universitetlərlə əlaqəli olub-olmamaqdadır. Bütün innovasiya parklarının universitetlərlə az-çox əlaqəli olması demək olar ki, zəruridir. Biznes parklarında isə belə şərt yoxdur. İnnovasiya parkları çox vaxt universitet şəhərciklərində yaradılır və ya onların fəaliyyəti universitetlərlə birbaşa əlaqəli şəkildə qurulur. Bu parkların rezidentlərinin çoxunun universitetlə birbaşa və ya dolayı əlaqələri var. Parkın rezidentləri həmin universitetin bəzi məzunlarını araşdırma aparmaq məqsədilə işə götürür. Digər rezidentlər universitetlə bağlanmış lisenziya və patent müqavilələri əsasında qurumun tədqiqat və texnologiyasından istifadə edə bilir (Məmmədov, Zeynalov, 2007).

Azərbaycan Respublikasının qanunvericiliyində innovasiya fəaliyyətinin stimullaşdırılmasına yönəldilmiş müddəalar əks olunub. Eyni zamanda müvafiq dövlət proqramları və strateji inkişafa dair sənədlərdə innovasiya fəaliyyətinin təşviqi və dəstəklənməsi məsələləri öz əksini tapmışdır (Ataşov, Novruzov, İbrahimov, 2014).

"Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritələrinin təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi" ndə innovasiya siyasəti və innovativ iqtisadiyyatın qurulması ilə bağlı bir sıra tədbirlər müəyyən edilmişdir. Bu sənət də

innovasiya fəaliyyəti istehsal və idarəetmə sahələrində əmək məhsuldarlığının və rəqabətqabiliyyətliliyin yüksəldilməsi, insan kapitalının inkişafında fasiləsizliyin təmin edilməsi üçün əsas hərəkətverici qüvvə kimi müəyyən edilmiş və ölkədə innovasiyanın təşviqini stimullaşdıracaq fəaliyyət planları və dövlət proqramları hazırlanarkən bu fəaliyyətin əhəmiyyətinə diqqət edilməsi nəzərdə tutulmuşdur ("Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi", 2016: 92).

Aqrar sahədə idarəetmə sistemindəki təkmilləşdirmələr və innovasiyaların tətbiqi xüsusilə dövlət dəstəyi tədbirlərinin səmərəliliyinin artırılması istiqamətində həyata keçirilən fəaliyyətlərdə özünü göstərir.

Elektron Kənd Təsərrüfatı İnformasiya Sistemi (EKTİS) Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin əsas fəaliyyət prinsiplərini (fermerlərə yaxınlığı, şəffaf və səmərəli idarəetməni və innovasiyanın tətbiqi) özündə ehtiva edən, daxili və xarici sistemlərlə inteqrasiya imkanlarını geniş əhatə edən və kənd təsərrüfatı zəncirinin qurulmasına zəmin yaradan vahid bir sistemdir (Makkonnell, Stenli, Bryu, 2009).

EKTİS, ilk növbədə, kənd təsərrüfatı məhsulları istehsalçılarına dövlət dəstəyi tədbirlərinin bütün mərhələləri ilə bağlı biznes prosesləri əhatə edən modulların formalaşdırılmasını özündə ehtiva edən şəffaf və operativ idarəetmə alətidir.

EKTİS kənd təsərrüfatının zamanla bütün sahələrini əhatə etməklə yanaşı, həmçinin kənd təsərrüfatı ilə bağlı bütün proseslərin məntiqi əlaqəliliyinin qurulmasına, proseslərin tamamlanmasına, analizlərin aparılmasına, müasir texniki həllərin tətbiqinə, dəqiq məlumatlara əsaslanan proqnozların verilməsinə imkan yarada bilən vahid sistemdir. EKTİS-də kənd təsərrüfatı proseslərinin düzgün həyata keçirilməsi və inkişafını təmin etmək üçün nəzarət mexanizmlərinin qurulması, habelə real vaxt rejimində proseslərin izlənilməsi imkanları mövcuddur (Frederik, Mişkin, 2021: 700).

EKTİS-də qərar verməyə kömək edəcək və gələcək inkişaf üçün planlama işlərinin əsasını təşkil edəcək analitik hesabatların hazırlanması və modellərin qurulması, müasir dövrün əsas tələbi olan "Big Data"nın toplanması və yaradılması imkanları vardır. Həmçinin EKTİS-in tətbiqi Azərbaycanda ilk dəfə subsidiyaların verilməsində şəffaflığı tam təmin etməklə aqrodataların toplanmasına, geniş təhlilinə imkan verir (Məmmədov, Zeynalov, 2007).

Azərbaycanda aqrar sektorda innovasiya fəaliyyətinin genişləndirilməsi istiqamətlərində müəyyən tədbirlər həyata keçirilmişdir. Xüsusilə son dövrlərdə innovativ yanaşmaların tətbiqi ilə bağlı təbliğat işləri artırılmışdır. Kiçik layihələr və startaplar formasında innovasiyaların yayımı ilə bağlı fəaliyyətlərin həyata keçirilməsinə başlanılmışdır. İnnovasiyaların fermerlər və aqrar sektorun inkişafı baxımından əhəmiyyəti, tətbiqi imkanları, dünya iqtisadiyyatında mövcud olan son innovativ texnologiyalarla bağlı kifayət qədər araşdırmalar aparılıb (Conatan, 2021: 896).

Hazırda kənd təsərrüfatı məhsulları istehsalının innovativ metodlarla həyata keçirilməsini stimullaşdırmaq məqsədilə dövlət tərəfindən dəstək tədbirləri həyata keçirilir. Belə ki, mövcud subsidiya qaydalarında müasir suya qənaət edən suvarma sistemlərinin tətbiqinin genişləndirilməsi məqsədilə intensiv bağlar üçün bu sistemlərin tətbiqi şərt kimi müəyyən edilib. Eyni zamanda fermerlərin müasir suvarma sistemlərinin quraşdırılması üçün investisiya xərclərinin müəyyən hissəsinin kompensasiya edilməsi məqsədilə avadanlıqların dəyərinin 40%-i dövlət tərəfindən subsidiyalaşdırılır. Ölkədə əkin sahələrinin təqribən 75 min hektarında müasir suvarma infrastrukturu yaradılıb. 2020-ci ildə bu məqsədlə 20.5 milyon manat dəyərində güzəşt tətbiq edilmişdir. Həmçinin kənd təsərrüfatında istifadə üçün nəzərdə tutulmuş dronlar, robot texnikası və ağıllı idarəetmə üzrə texnoloji avadanlıqların satışına dövlət tərəfindən 40% güzəşt tətbiq edilir (Məmmədov, Zeynalov, 2007).

## Nəticə

Ümumilikdə isə ölkədə innovasiya məhsulu istehsalının təşkili və tətbiqi yüksək investisiya tələb edən sahədir. Həmçinin innovativ yanaşmaların tətbiqi maliyyə tutumlu olmaqla yanaşı, həm də elmtutumlu sahə hesab olunur. Bununla belə gələcəkdə Azərbaycanda aqrar sektorun dayanıqlı

inkişafı məhz innovativ texnologiyaların tətbiqi ilə mümkün olacaqdır. Bu baxımdan kənd təsərrüfatı istehsalçıları kontekstində innovativ texnologiyaların tətbiqinin genişləndirilməsi birbaşa olaraq dövlət dəstəyi ilə bağlıdır. Başqa sözlə, ölkədə aqrar sektorun innovativ texnologiyaların tətbiqi ilə inkişafı dövlətin bu sahədə həyata keçirdiyi təşviq tədbirlərindən asılıdır.

Burada dövlətin, akademik institutların və özəl sektorun tətbiqi araşdırmalar və iqtisadi inkişaf məqsədilə bir arada fəaliyyət göstərməsi üçün ölkədə vahid məkanın yaradılması nəzərdə tutulur. Hökumətlər üçün innovasiya parkları iqtisadi inkişaf üçün bir vasitədir. Özəl sektor üçün innovasiya parkları işçi və sərmayə xərclərini minimallaşdıran, universitetlərin yüksək ixtisaslı işçi və tədqiqatçılarından, fiziki və laboratoriya imkanlarından istifadə edə bildikləri bir vasitədir. Akademik institutlar üçün innovasiya parkları tədqiqatları maliyyələşdirməkdə hökumət və özəl sektordan qrantlar əldə etmək üçün bir vasitədir. Hər üç tərəf bir-biriləri ilə sıx münasibətdə olaraq xərclərin azaldılmasında maraqlıdır.

## Ədəbiyyat


1. "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi". (2016). 92 s.
2. "Azərbaycanda innovasiya siyasətinin effektivliyinin artırılması yolları".
3. «İnvestisiya fəaliyyəti haqqında» Azərbaycan Respublikasının Qanunu.
4. Məmmədov, Z.F., Zeynalov, V.Z. (2007). Maliyyə pul tədavülü və kredit. Bakı.
5. Sadıqov, M.M., Hüsyenov, M.C., Həsənov, H.H. (2012). Kənd təsərrüfatının maliyyəsi. Gəncə.
6. Abbasov, A.N. (2005). Qiymətli kağızların formalaşması və inkişafı. Bakı.
7. Məmmədov, S.M. (2021). Rəqəmsal keçid və elmi texnoloji inkişafın sürətləndirilməsi zəruriliyi. Bakı.
8. Hüseynov, M.C., Novruzova, B.Y., Əsgərov, R.Ə. (2017). Kənd təsərrüfatının maliyyəsi. ADAU, 248 s. https://atm.gov.az/az/news/562/qubada-innovasiya-festivali-kecirilib/
9. https://agroeconomics.az/az/article/34/isgaldan-azad-olunan-erazilerimizde-kend-teserrufa/
10. Kərimov, A.E., Babayev, A.A. (2007). Qiymətli kağızlar bazarı. Bakı.
11. Ataşov, B., Novruzov, N., İbrahimov, E. (2014). Maliyyə nəzəriyyəsi. Bakı.
12. Makkonnell, I., Stenli, L., Bryu. (2009). Ekonomiks, 19 izdaniye.
13. Frederik, S., Mişkin. (2021). Pul, bank və maliyyə bazarlarının iqtisadiyyatı. TEAS Press Nəşriyyat evi. Bakı, 700 s.
14. Conatan, Q. (2021). Dövlət maliyyəsi və dövlət siyasəti. Worth Publishers. TEAS Press Nəşriyyat evi. Bakı, 896 s.


Göndərilib: 12.12.2023 Qəbul edilib: 05.02.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/14-19

**Nizami Əkbərov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
kimya üzrə fəlsəfə doktoru
adpu-kimya@mail.ru
**Kəmalə İskəndərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
kimya üzrə fəlsəfə doktoru
kemaleisva@mail.ru
**Gülnarə İsmayılova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
kimya üzrə fəlsəfə doktoru
gulnara.ismayilova@yandex.ru
https://orcid.org/0009-0005-4611-8754

# KEYFİYYƏTLİ TƏHSİL VƏ MÜASİR TƏLİM METODLARI

**Xülasə**

Bu məqalə keyfiyyətli təhsilin əsas aspektlərinin və təhsilin keyfiyyətinin yüksəlməsinə müasir təlim metodlarının təsirinin izahına həsr olunmuşdur. Qeyd olunmuşdur ki, keyfiyyetli təhsil məhz fənlərin keyfiyyətli tədrisindən başlayir. Təhsildə müasir təlim metodlarından da düzgün və məqsədli şəkildə istifadə olunması onun keyfiyyətinə əsaslı dərəcədə müsbət təsir edir.

***Açar sözlər:*** *təhsil, tədris, təlim, fənlər, müəllim, tələbə, keyfiyyətli təhsil, məktəb, universitet, öyrənmək, oxumaq*

**Nizami Akbarov**
Azerbaijan State Pedagogical University
PhD in Chemistry
adpu-kimya@mail.ru
**Kamala Iskanderova**
Azerbaijan State Pedagogical University
PhD in Chemistry
kemaleisva@mail.ru
**Gulnara Ismayilova**
Azerbaijan State Pedagogical University
PhD in Chemistry
gulnara.ismayilova@yandex.ru
https://orcid.org/0009-0005-4611-8754

## Quality education and modern training methods

**Abstract**

This article is devoted to the explanation of the main aspects of quality education and the influence of modern teaching methods on the improvement of the quality of education. It was noted that quality education begins with quality teaching of subjects. Correct and purposeful use of modern training methods in education has a fundamentally positive effect on its quality.

***Keywords:*** *education, teaching, training, subjects, teacher, student, quality education, school, university, learning, reading*

## Giriş

Həmişə təhsil sahəsində aparılan bütün islahatların məqsədi, məhz onun keyfiyyətinin yüksəldilməsinə nail olmaqdan ibarət olmuşdur. Çünki keyfiyyətli təhsil cəmiyyətin, dövlətin əsas sütunlarından biridir, daha sivil cəmiyyətin yaranmasının hərəkətverici qüvvəsidir.

Keyfiyyetli təhsil məhz *fənlərin keyfiyyətli tədrisindən* başlayir (Akanbayeva, 2014: 134-135; Əliyev, 2006: 70-88). Fənnləri tədris edən müəllimlər yaşadıqları cəmiyyətin güzgüsu və onun hərəketverici qüvvəsidir. Həmişə müəllim adı müqəddəs olmuş və onların bir coxu xalqın maariflənməsində, inkişafında əvəzsiz rol oynamışlar. Xüsusilə, pedaqoji universitetlərdə çalışan bu şərəfli peşə sahibləri cəmiyyət üçün saysız-hesabsız layiqli kadrlar, müxtəlif fənlər üzrə cox savadlı və yüksək intellektli əsil vətənpərvər müəllimlər ordusu hazırlamışlar. Ona görə pedaqoji universitetlərin müəllimlərinə çox vaxt, düzgün olaraq, "müəllimlər müəllimi" de deyirlər. Onlar bu şərəfli adı doğrultmaq üçün, universitetdə yüksək səviyyəli tədrislə məşğul olaraq təhsilin keyfiyyətini yaxşılaşdırmalıdırlar. Müəllimlər hazırlayan universitetlərdə təhsil son dərəcə keyfiyyətli və hərtərəfli olmalı, savadlı müəllimlərin yetişdirilməsi işinə xidmət etməlidir.

Əbəs deyil ki, Ulu öndər Heydər Əliyev demişdir: "Mən yer üzərində müəllimdən yüksək ad tanımıram". Dahilərdən biri də belə bir fikir söyləmişdir ki, əgər bir xalqı, bir milləti məhv etmək istəyirsənsə, onun müəllimlərini savadsız yetişdirmək kifayət edir. Onda o millət öz-özünə məhv olacaq və onu məhv etmək üçün müharibə etməyə belə ehtiyac qalmayacaqdır (Əliyev, 2007: 42-56; Mehrabov, 2005: 24-29).

Lakin müəllimlik peşəsi nə qədər şərəfli və yüksək olsa da, bir o qədər məsuliyyətli və çətindir. Dövlətin hər hansı bir sahədə: hərbi, iqtisadi, sosial və s. qüdrətli olması cəmiyyətdəki müəllimlərdən birbaşa asılıdır. Belə ki, baxçadakı tərbiyəçi müəllimədən başlayaraq, universitetdə mühazirə oxuyan müəllimlərədək bütün müəllimlər sanki, cəmiyyətin barometridir. Onlar yüksək biliyə, intellektə malik olsalar, cəmiyyət üçün savadlı, mədəni, ədalətli, bacarıqlı vətəndaşlar yetişdirəcəklər, həmin vətəndaşlar da öz növbəsində, normal cəmiyyət, iqtisadi və hərbi cəhətdən çox qüdrətli bir dövlət quracaqlar. Məhz buna görə də universitetlərdə təhsil sön dərəcə keyfiyyətli və hərtərəfli olmalı, daim xalqın, millətin, vətənin rifahı naminə çalışan vətəndaşların yetişdirilməsi işinə xidmət ettməlidir. Bəli, universitetlərdəki tədrisin əsas qayəsi də məhz bundan ibarət olmalıdır (Akanbayeva, 2014: 134-138).

Keyfiyyətli təhsil - fənlərin yüksək səviyyəli, dünya standartlarına uyğun şəkildə tədrisindən birbaşa asılıdır. "Keyfiyyətli təhsil yüksək səviyyəli tədrisdən başlayır" desək, heç də yanılmarıq. Ona görə universitetlərdə keyfiyyətli təhsilə nail olmaq üçün ilk növbədə, ayrı-ayrı fənlərin tədrisinin səviyyəsini yüksəltmək lazımdır. Son illərdə çap olunmuş yerli və xarici dərsliklərindən, internet materiallarından, vikipediyalardan istifadə edərək mükəmməl mühazirə materialı hazırlanması fənnlərin bugünkü keyfiyyətli tədrisinin və bütövlükdə keyfiyyətli təhsilin əsas şərtlərindəndir (Veysova, 2004: 38).

Fənlərin düzgün istiqamətdə tədrisi keyfiyyətli təhsilin əsas amillərindən biridir və onlar bir sıra şərtlərlə əsaslandırıla bilər. Çünki təhsil, ilk növbədə, fənlərin tədrisindən başlayır. Tədrisin keyfiyyətini yaxşılaşdırmaq üçün hər bir fənn müəllimi çox böyük məsuliyyət daşımalıdır. Belə ki, universitetlərdə yüksək səviyyəli tədris prosesinə və keyfiyyətli təhsilə nail olmaq üçün:

1) Hər bir fənn müəllimi dərin nəzəri biliyə malik olmalı və bu bilikləri tələbələrə pedaqoji ustalıqla, müasir tədris metodlarından istifadə etməklə çatdırmalıdırlar. Bunun üçün onlar, ilk növbədə, ən müasir dərslik və dərs vəsaitlərindən (hətta dünya ədəbiyyatlarından və internet materiallarından belə) istifadə etməklə, yüksək səviyyəli və zəngin məlumatlı cox mükəmməl və dolğun, lakin açıq və aydın şəkildə, tələbələrin asanlıqla başa düşəcəkləri tərzdə olan mühazirə materialları hazırlanmalıdır. Mühazirə materiallarının daha asan qavranılması üçün, yeri gəldikcə, ona şəkil və qrafiklər, sxemlər, cədvəllər və digər interaktiv materiallar da daxil edilməlidir.Yaxşı olardı ki, mühazirələrin elektron versiyaları da tərtib edilsin və sayıtlarda yerləşdirilsin (Əkbərov, 2022: 127-129).

Mühazirə materiallarının izahı yaxşı olardı ki, tələbələrlə dialoq əsasında, keçilən mühazirələrə və əvvəllər tədris olunmuş fənlərdən alınmış köhnə biliklərə istinad edilərək aparılsın. Bu məqsədlə

müəyyən sorğular da aparıla bilər. Təbiət elmləri, xüsusilə, kimya ixtisası üzrə keçilən materiallar və əldə olunan biliklər təcrübi dərslərdə daha da möhkəmləndirilməlidir. Təcrübi məşğələlərdə həm də vizüal yaddaş tələbələrə dərsi daha mükəmməl başa düşməyə kömək edir. Hər bir mühazirə materialı yaxşı mənimsənilsin deyə, dərsin sonunda əsas prinsiplər və nəzəri materiallar məsələ və çalışmalar həlli ilə məhkəmləndirilməli və evə də həlli məntiqi təfəkkür və əqli düşüncə tələb edən məsələ və çalışmalar, sual və tapşırıqlar verilməlidir (Yaponiya təhsil sistemində olduğu kimi). Artıq köhnə qaydalardan imtina edərək (yazı taxtasında təbaşirlə yazmaqdan), daha müasir təlim-tədris metodlarından istifadə etməklə, mühazirə materialları müasir metodlarla tələbələrin heç bir maniəsiz, açıq-aydın görə və eşidə biləcəkləri manitorlara verilməli və elektron karandaşlarla onlar üzərində izahat işləri aparılmalıdır (Polat, 2002: 9-17).

2) Müəllimlərin elmi və pedaqoji bacarıqları inkişaf etdirilməlidir. Onlar daim öz üzərlərində işləməli, nəzəri və praktik biliklərini genişləndirməlidirlər. Bununla əlaqədar olaraq, hər kafedra həftənin məlum bir günündə seminarlar, elmi diskussiyalar təşkil etməli, müntəzəm sürətdə açıq dərslər aparılmalı və lazım gələrsə, fakültənin qabaqcıl və əlaçı tələbələri də bu proseslərə cəlb olunmalıdırlar. Vaxtaşırı müəllimlərin və tədrisdə olan laborantların attestasiyaları keçirilməli və onların daim öz biliklərini müasir standartlar səviyyəsinə qaldırmaları stimullaş-dırılmalıdır. Lazım gəldikdə də onlar respublikanın və dünyanın qabaqcıl ali məktəblərinə təkmilləşmə kurslarına göndərilməli və dünya standartlarına inteqrasiya prosesi getməlidir. Kafedralarda müasir dünya ədəbiyyatları əsasında gənc nəslə düzgün istiqamətdə təhsil verə bilən, savadlı və yüksək intellektli müəllimlərin yetişdirilməsi işinə xidmət edən tədris planları, fənn proqramları, onlar əsasında dərsliklər, dərs vəsaitləri və metodik vəsaitlər, sillabuslar hazırlanmalıdır.

3) Müəllimlər yüksək praktik vərdişlər əsasında təbii xammallardan xalqın rifahı naminə istifadə etməyin yollarını tələbələrə göstərməli, onların diqqətini bu sahəyə cəlb etməlidir. Tələbələr bu cür mövzularda kurs işləri, referatlar yazmağa cəlb olunmalıdırlar.

4) Fənn olimpiadaları təşkil olunmalı və hər kurs tələbələri üçün onların keçdikləri tədris materiallarına uyğun olaraq suallar tərtib olunmalı və qaliblər universitet rəhbərliyi tərəfindən mükafatlandırılmalıdır. Dekanlıqlar vaxtaşırı fakültə elmi şuralarını keçirərək, tədrisin keyfiyyətinin göstəricilərini obyektiv şəkildə analiz etməli, yol verilən səhvlərin dərhal aradan qaldırılması istiqamətində təxirəsalınmaz işlər aparmalıdır (Əlizadə, 2001).

5) Tələbələrin pedaqoji və istehsal praktikaları təşkil olunmalı, qabaqcıl orta məktəblərlə və istehsal müəssisələri ilə danışıqlar aparılmalıdır. Bioloqların respublikanın flora və faunasını, kimyaçıların isə respublikanın kimya zavodlarının texnoloji proseslərini mükəmməl öyrənmələrinə şərait yaradılmalı və bütün bunlara ciddi nəzarət olunmalıdır.

6) Tələbə-elmi cəmiyyətlərinin fəaliyyəti genişləndirilməli, lazım gələrsə, bu sahədə maddi-maraq prinsiplərindən istifadə edilməli, ən yaxşı və yaradıcı tələbə-elmi işləri üçün mükafatlar təsis olunmalıdır.

7) Vaxtaşırı kollekviumlar və yoxlamalar təşkil olunmalı, tələbələrin aldıqları nəzəri və praktik biliklər obyektiv qiymətləndirilməli və onların yüksək bilik əldə etmələri stimullaşdırılmalıdır.

8) Bütün tədris prosesində müəllim-tələbə münasibətləri tam demokratik əsaslarla qurulmalı, bu mçünasibətlər müasir standartlar və tələblər səviyyəsinə qaldırılmalıdır. Baloniya sisteminə uyğun olaraq, tələbələrin özlərinə müəllimləri seçmə imkanları yaradılmalıdır. Belə olan halda müəllimlər öz fənlərini daha dərindən, daha maraqlı və müasir tədris vasitələrindən istifadə etməklə daha yüksək səviyyədə tədris etməyə çalışacaqlar. Rektorluq-dekanlıq-müəllim-tələbə münasibətləri tam demokratiya və səmimiyyət əsasında, "ancaq keyfiyyətli təhsil naminə" ruhunda qurulmalıdır.

9) Tədrisin keyfiyyəti müəyyən meyarlarla qiymətləndirilməli və onun son nəticəsi hesablanmalıdır. Nəticə ölçülən olmalı, müəllimlərin əməyi diferensial-laşmalı və təhsilin keyfiyyət göstəricilərinə uyğun olmalıdır. Bunun üçün müəyyən standartlar müəyyənləşməli və maddi-maraq prinsipindən istifadə edilməlidir.

10) Tədris olunan fənnin tələbələr tərəfindən nə dərəcədə mənimsənilməsini yoxlamaq və tədrisin keyfiyyətinə nəzarət etmək üşün vaxtaşırı olaraq, kollekviumlar, sınaqlar aparılmalı, tələbələrə kurs işləri, sərbəst işlər verilməlidir. Bütün, imtahan, yoxlama və qiymətləndirmələr

obyektiv aparılmalı, "Təhsildə güzəşt yoxdur!" şüarına ciddi əməl olunmalıdır (digər inkişaf etmiş ölkələrdə olduğu kimi). Semestir imtahanları əgər test üsulu ilə keçirilərsə, açıq testlərə, yazılı imtahanlarda isə məhtiqi təfəkkür tələb edən suallara üstünlük verilməlidir.

11) Tələbələrə verilən kurs işləri, referatlar yaradıcılıq qabiliyyəti tələb edən olmalı, mənbələrdən mexaniki köçürmə xarakteri daşımamalıdır. Sərbəst işlər isə çalışmalar əsasında tərtib olunaraq, tələbələrdən məntiqi düşüncə tələb edən və onların əqli inkişafına xidmət edən formada olmalıdır. Nümunəvi kurs işləri və sərbəst işlər üçün mükafatlar təsis olunmalı, həvəsləndirmə metodlarından istifadə edilməlidir.

12) Vaxtaşırı tələbələrin respublikanın qabaqcıl müəllimləri, tanınmış pedaqoqları, elm adamları: kimyaçıları və bioloqları ilə görüşünü təşkil etməli, tələbələr onların dəyərli məsləhətlərindən faydalanmağa ruhlandırılmalıdır (İlyasov, 2018: 47).

13) Tədris, həm də dövlət siyasətinə sadiq olmalı, keyfiyyətli təhsiliə və nəticədə güclü iqtisadi qüdrətə, xalqın rifah halının yüksəlməsinə xidəmlə sıx bağlı olduğunu, "savadlı adam heç vaxt ədalətsiz ola bilməz" prinsipini öndə tutmalı, universitetdə təhsil alan tələbələr – gələcəyin müəllimləri cəmiyyətin əsl hərəkətverici qüvvəsi, xeyirxah və bacarıqlı vətəndaşlar kimi, vətənpərvər və maarifçi ruhda yetişdirilməlidir.

14) Ana dilində çap olunmuş keyfiyyətli və sanballı dərsliklər, dərs vəsaitləri, metodik və elmi-metodik vəsaitlər olmadan yüksək səviyyəli tədrisdən söhbət gedə bilməz. Çünki, tələbələrin böyük əksəriyyəti əcnəbi dillərdə olan ədəbiyyatlardan demək olar ki, istifadə edə bilmirlər. Ona görə də kafedralara tapşırılmalıdır ki, ana dilində müasir dərsliklər cox az olduğu üçün, vaxtaşırı dərsliklər, dərs vəsaitləri və metodik vəsaitlər nəşr etdirsinlər. Bunun üçün konkurslar təşkil edilsin və yaxşı kitablar mükafata layiq görülərək universitetin kitabxanası üçün alınsın.

15) Daha keyfiyyətli tədrisə nail olmaq üçün fənnlərarası əlaqələrə geniş yer verilməlidir (Applikation of innovations to chemistry teaching metods in Azerbaijan, 2014: 312; Avidov-Ungar, Forkosh-Baruch, 2018: 183-191).

## Nəticə

Beləliklə, bu deyilən istiqamətlərdə işin qurulması üçün tədrisə məhz peşəkar, tələbələrin psixologiyasını, müasir pedaqogikanı mükəmməl bilən vicdanlı və savadlı müəllimlər cəlb olunmalıdır. Tədrisin müasir tələblər səviyyəsində qurulması, onun keyfiyyətinin yüksəldilməsi bütövlükdə cəmiyyətin saflaşmasına və sonda onun iqtisadi, hərbi, sosial və s. sahələrdə qüdrətinin artmasına gətirərdi.

Müasir təlim və tədris metodlarına aşağıdakılar daxidir (Əkbərov, Həsənli, 2002: 9-18):

***1. Mühazirə*** - informasiyanın ötürülməsinin şifahi formasıdır (mühazirə zamanı əyani vasitələrdən istifadə olunur).

***2. Seminar*** - müəllim və tələbələrin öyrənilən məsələlərin birgə müzakirəsi və müəyyən problemlərin həlli yollarının axtarışıdır.

***3. Təlim*** - tədris üsuludur, onun əsasını pedaqoji prosesin praktiki tərəfi təşkil edir, nəzəri cəhəti isə yalnız yüksək elmi biliklərin əldə olunmasına xidmət edir.

***4. Modul təlim*** - təhsil məlumatlarının *modul* adlanan bir neçə nisbətən müstəqil hissələrə bölünməsidir.

***5. Distant təhsil*** - pedaqoji prosesdə telekommunikasiya vasitələrinin istifadəsini nəzərdə tutur ki, bu da müəllimə tələbələrdən çox uzaqda olarkən dərs keçməyə imkan verir.

***6. Dəyər oriyentasiyası*** - tələbələrə dəyərlərin aşılanmasına, onları sosial və mədəni ənənə və qaydalarla tanış etmək işinə xidmət edir.

***7. Keys metodu*** - tələbələrin öyrəndiyi bilik və fəaliyyət sahəsində baş verə biləcək vəziyyətlərin tam öyrənilməsinə və təhlilinə əsaslanır.

***8. Məşqçilik*** - müəllimlər və ya daha təcrübəli tələbələr tərəfindən daha az təcrübəsi olan tələbələrin fərdi və ya kollektiv şəkildə idarə edilməsi və öyrənilən mövzu üzrə bilik və bacarıqların dərk edilməsidir.

***9. Rol oyunları*** - öyrənilən mövzu və ya mövzu çərçivəsində yaradılan oyunun məqsədlərinə cavab verən şəraitdə müəyyən edilmiş rolların tələbələr tərəfindən yerinə yetirilməsidir.

***10. Biznes oyunu*** *(işgüzar oyun)* - öyrənilən mövzu və ya intizamla əlaqəli hər cür vəziyyətləri və ya fəaliyyət aspektlərinin xüsusiyyətlərini simulyasiya edir.

***11. Model fəaliyyəti*** - mənimsənilən sahədə davranış, tapşırıqların yerinə yetirilməsi və təqlid üçün nümunə olan davranış modelini nümayiş etdirməkdən ibarətdir.

***12. Yaradıcı qruplar*** - əsasən, müəllimlərdən - müxtəlif fənlər üzrə mütəxəssislərdən ibarətdir və hər hansı bir fənnin tədrisinə yönəlmiş pedaqoji prosesin təkmilləşdirilməsi metodlarının işlənib hazırlanması ilə məşğul olurlar.

***13. "Qırıntı"nın təhlili üsulu*** - real həyatda tez-tez yaranan və böyük iş həcmi ilə xarakterizə olunan vəziyyətləri simulyasiya etmək, belə vəziyyətlərin yaratdığı problemləri həll etməyin ən təsirli yollarını hazırlamaqdır.

***14. Cüt işləmək*** - cütlü iş metodunun tələblərinə əsasən, bir şagird digəri ilə qoşalaşır və yeni fəaliyyətin mənimsənilməsi prosesində başqalarından rəy və qiymətləndirmənin alınmasına zəmanət verilir.

***15. Refeksiya metodu*** - tələbələrin materialı müstəqil qavraması üçün lazımi şəraitin yaradılmasını və öyrənilən materialla bağlı, onların fəal tədqiqat mövqeyinə daxil olmaq bacarığının inkişaf etdirilməsini nəzərdə tutur.

***16. Fırlanma*** *(rotasiya)* üsulu - tələbələr üçün fəaliyyət və ya dərs zamanı müxtəlif rolların təyin edilməsindən ibarətdir ki, onlar müxtəlif təcrübələr qazana bilsinlər.

***17. Lider-izləyici metodu.*** Bu üsulda bir tələbə (və ya qrup) tanış olmayan bacarıqlara yiyələnmək üçün daha təcrübəli şagirdə (və ya qrupa) qoşulur.

***18. "Uçan" üsulu.*** Bu - sadə söz öyrənilən mövzuya və ya problemə aid olan, hal-hazırda aktual məsələlərin məlumat və fikir mübadiləsi yolu ilə həll olunduğu, nəticədə tələbələrin bacarıqlarının artırılmasına imkan verən üsuldur.

***19. Mifologem metodu*** - real şəraitdə yaranan problemləri həll etmək üçün qeyri-adi yolların axtarışını əhatə edir.

***20. Təcrübə mübadiləsi metodu*** - tələbənin qısamüddətli başqa təhsil yerinə köçürülməsini və sonra geri qayıtmasını nəzərdə tutur.

***21. Beyin fırtınası*** metodu.

***22. Tematik müzakirələr*** metodu və s. müasir metodlar mövcuddur.

## Ədəbiyyat


1. Akanbayeva, S.K. (2014). Kachestvennoye obrazovaniye – problemy i puti resheniya. Mezhdunarodnyy zhurnal prikladnykh i fundamental'nykh issledovaniy. № 8-4, s.134-135.
2. Əliyev, A.H. (2006). Kimyanın tədrisində yeni pedaqoji texnalogiyalardan istifadə. Kimya məktəbdə, 3(l5), s.70-88.
3. Əliyev, A.H. (2007). Ümumtəhsil məktəblərində kimyanın tədris edilməsi və təliminə verilən müasir tələblər. Kimya məktəbdə, l (l7), s.42-56.
4. Mehrabov, A.O. (2005). Təlim prosesində konstruktiv öyrənmə modeli, idraki və sosial münasibətlərin formalaşma xüsusiyyətləri. Azərbaycan məktəbi, № 3, s.24-29.
5. Akanbayeva, S.K. (2014). Kachestvennoye obrazovaniye – problemy i puti resheniya. Mezhdunarodnyy zhurnal prikladnykh i fundamental'nykh issledovaniy. № 8-4, s.134-135.
6. Veysova, Z. (2004). Məktəb təhsilverənləri üçün fəal təlim kuslarına giriş kursu. Uniseflə birgə layihə. Bakı: Meqa-Print, 38 s.
7. Əkbərov, N.Ə. (2022). Kimya dərslərində əldə olunan biliklərin formalaşmasinda kimyəvi eksperiment və təcrübələrin rolu. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 99-cu ildönümünə həsr olunmuş doktorant, magistrant və gənc tədqiqatçıların «Kimya və kimya texnologiyası» mövzusunda Respublika elmi konfransının materialları. Bakı: BDU, 466 s; s.127-129.

8. Polat, Ye.S. (2002). Metod proyektov: tipologiya i struktura. Litseyskoye i gimnazicheskoye obrazovaniye. № 9, s.9-l7.
9. Əlizadə, Ə.Ə. (2001). Yeni pedaqoji təfəkkür: ideyalar, prinsiplər, problemlər. Bakı: "Adiloğlu" nəşriyyatı.
10. İlyasov, M.İ. (2018). Təhsilverən peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. Bakı, Elm və təhsil, 47 s.
11. Applikation of innovations to chemistry teaching metods in Azerbaijan. (2014). Asosjournal. The Jornal of Akademic Sosial Science. Turkey, 312 p.
12. Avidov-Ungar, O., Forkosh-Baruch, A. (2018). Professional identity of teacher educators in the digital era in light of demands of pedagogical innovation, Teaching and Teacher Education, vol. 73, pp.183-191.
13. Əkbərov, N.Ə., Həsənli, Ş.V. (2002). Fənlərarası əlaqələr. Şagirdlərin fizikadan aldqları biliklərin kimyanin öyrənilməsində rolu. Kimya məktəbdə – Elmi-nəzəri və metodik məcmuə, № 1 (77), s.9-18.

Göndərilib: 12.12.2023 Qəbul edilib: 05.02.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/20-27

**Qorxmaz Hüseynov**
Naxçıvan Dövlət Universiteti
kimya üzrə fəlsəfə doktoru
huseynli72@list.ru
**Şəhriyar Camalzadə**
Naxçıvan Dövlət Universiteti
magistrant
camalzadsehriyar@gmail.com

# SİNİFDƏNXARİC İŞLƏRDƏ ŞAGİRDLƏRDƏ KİMYADAN TƏDQİQATÇILIQ BACARIĞININ FORMALAŞDIRILMASI

**Xülasə**

Məqalədə kimya fənindən şagirdlərdə tədqiqat bacarığının formalaşdırılması üsulları verilmiş, şagirdlərin yüksək səviyyədə təhsilini təmin etmək üçün onların təfəkkürünü hərtərəfli inkişaf etdirmək, biliklərini müstəqil şəkildə tətbiq etmək yolları təhlil edilmişdir. AMEA Naxçıvan Bölməsi ilə Naxçıvan Muxtar Respublikası Təhsil Nazirliyinin birgə həyata (2019-2023-cü illərdə) keçirdiyi “Sabahın tədqiqatçıları” layihəsində aparılan müşahidələr əsasında kimya fənindən şafirdlərdə tədqiqat bacarığının formalaşdırılmasının metodolofiyası işlənmiş, tədqiqat işinin yerinə yetirilmə mərhələri müəyyən edilmişdir.

***Açar sözlər:*** *sinifdənxaric iş, kombinəedilmiş dərs, bilik, bacarıq, vərdişlər, kimyəvi təcrübə, sabahın tədqiqatçıları, tədqiqat*

**Gorkhmaz Huseynov**
Nakhchivan State University
PhD in Chemistry
huseynli72@list.ru
**Shahriyar Jamalzade**
Nakhchivan State University
master student
camalzadsehriyar@gmail.com

## Formation of chemistry research skills in students in extracurricular activities

**Abstract**

In the article, the methods of forming research skills in chemistry students were given, ways to comprehensively develop students' thinking and independently apply their knowledge were analyzed in order to ensure high-level education of students. On the basis of the observations made in the "Researchers of the future" project jointly implemented by the Nakhchivan Department of ANAS and the Ministry of Education of the Nakhchivan Autonomous Republic (in 2019-2023), the methodology of forming research skills in chemistry students was developed, and the stages of the research work were determined.

***Keywords:*** *extracurricular work, combined learning, knowledge, skill, habits, chemical experience, researchers of tomorrow, research*

## Giriş

Kimyanın tədrisində ən çox kombinəedilmiş dərs tipinin tətbiq olunması məqsədəuyğun hesab edilir. Bir neçə didaktik vəzifəni yerinə yetirən dərslərə kombinə edilmiş dərslər deyilir (Bataeva, 2004: 22-27). Belə dərslərdə məlum materialların təkrar olunması, dərinləşdirilməsi, yeni materialın izah olunması, möhkəmləndirilməsi, bacarıq və vərdişlərin formalaşdırılması, biliklərin

yoxlanılması və s. kimi məsələlərin həll edilməsinə imkan yaranır. Bu tip dərslərin yeni tədris vahidinin öyrənilməsinə başlanıldıqda həyata keçirilməsi məsləhət bilinir (Besedina, 2012: 21-25).

Kimya dərslərində şagirdlərin əldə etdikləri bilik, bacarıq və vərdişlərin inkişafına daima nəzarət etmək, çatışmazlıqları, nöqsanların vaxtında aşkar etmək və onları aradan qaldırmaq üçün müvafiq qabaqlayıcı tədbirlərin görülməsi də vacib olan tələblərdəndir (Fedorov, Metelev, Solovev, Shlyukova, 2012: 167).

Kimya eksperimental-nəzəri elmdir. Bu sahədə maddələrin və proseslərin öyrənilməsi eksperiment nəticəsində əldə edilmiş faktların təhlilinə, onların nəzəri izahına və ümumiləşdirilməsinə əsaslanır (Iodiko, 1983: 17). Kimya dərslərində tədqiqat vərdişlərinə yiyələnmək üçün əsas yük eksperimental tapşırığın, hesablama hissəsinin, elmi fərziyyə və nəticələrin formalaşdırılması laboratoriya təcrübələrinə düşür. Belə ki, tədqiqat bacarıqlarının tam inkişafı praktiki iş zamanı baş verir (Veysova, 2013: 105-108; Podkopaeda, 2010: 16-24).

Kimyəvi təcrübə dərsdə vizuallaşdırmanın ən vacib üsulu və əsas vasitəsidir. O, irəli sürülən fərziyyələrin doğruluğunu yoxlamaq və təhsil problemlərini həll etmək üçün istifadə olunur. Şagirdlər təcrübə vasitəsilə maddələr və onlarla baş verən dəyişikliklər haqqında məlumat əldə edirlər. Təcrübənin pedaqoji əhəmiyyəti ondan ibarətdir ki, onu müşahidə edərkən şagird mürəkkəb kimyəvi proseslərin idarə oluna biləcəyinə, ilk baxışda anlaşılmaz görünən hadisələrdə sirli heç nə olmadığına əmin olur. Bu baxımdan eksperiment tədris metodu kimi inkişaf etdirici və tərbiyəvi funksiyanı yerinə yetirir (Stepanova, 2005: 96).

Müasir məktəbin vəzifəsi təkcə şagirdlərin yüksək səviyyədə təhsilini təmin etmək deyil, həm də onların təfəkkürünü hərtərəfli inkişaf etdirmək, biliklərini müstəqil şəkildə genişləndirməkdir (Mehrabov, 2013: 5-10; Əliyev, Əliyeva, Cabbarov, 2011). Kimya dərslərində və dərsdənkənar saatlarda şagirdlərin tədris və elmi-tədqiqat fəaliyyətinin təşkilinə dair bəzi nümunələrə baxaq.

Şagirdlərin elmi-tədqiqat fəaliyyətinin təşkilində sistem qurma prinsipi təşəbbüskarlıq prinsipidir (Həmzəyev, 1991). Uşaq tədqiqatın gedişatını ancaq yaşamaqla, yəni öz təcrübəsi ilə mənimsəyə bilər. Buna görə də müəllimin vəzifələrindən biri şagirdə elmi tədqiqatın metodlarını, prinsiplərini, forma və metodlarını, peşə biliklərinin və elmi biliyin əsaslarını öyrətmək, elmi tədqiqat xarakterli problemləri həll etməklə müstəqil həyata keçirmək imkanı yaratmaqdır (Hukina, 1986: 43).

Yaradıcı fəaliyyətin ən qiymətli növü şagirdin müstəqil həyata keçirdiyi tədqiqat işidir (Zaqranisnaya, İvanova, 2010: 10-15). Məktəblərdə bu tip tədqiqatlar olduqca nadirdir. Bunun səbəbi subyektivdir. Çox az uşaq yaradıcı kəşfiyyatla məşğul olmaq qabiliyyətinə, ən əsası isə istək və vaxta malikdir.

AMEA Naxçıvan Bölməsi ilə Naxçıvan Muxtar Respublikası Təhsil Nazirliyinin birgə həyata (2019-2023-cü illərdə) keçirdiyi "Sabahın tədqiqatçıları" layihəsində gələcək nəsil tədqiqatçıların formalaşmasında bir çox nailiyyətlər qazanılmışdır. Layihənin əsas məqsədi ümumtəhsil məktəblərinin IX-XI siniflərində təhsil alan şagirdlərin elmi axtarışlara sövq edilməsi, onların intellektual potensiallarının və yaradıcılıq fəaliyyətinin stimullaşdırılması, elmi-tədqiqat işinə meyili istedadlı şagirdlərin aşkar edilməsidir.

Hər il layihə çərçivəsində Naxçıvan şəhərinin ümumtəhsil məktəblərinin 50 şagirdi bölmə əməkdaşları tərəfindən hamiliyə götürülərək, fərdi və kollektiv şəkildə tədqiqatlara cəlb edilir və uğurlu nəticələr əldə olunur. Bölmə əməkdaşlarının rəhbərliyi ilə şagirdlər müxtəlif layihələrdə iştirak etmiş və əldə etdikləri nailiyyətlərə görə diplom və medallar qazanmışlar.

"Sabahın tədqiqatçıları" layihəsində kimya üzrə iştirak edən şagirdlər Naxçıvan Muxtar Respublikasının mineral xammalı əsasında geniş praktiki əhəmiyyətə malik birləşmələri almaq məqsədini qarşıya qoymuşdur. Bu maddələr xalq təsərrüfatının bütün sahələrində - yeyinti sənayesi, tikinti materiallarının istehsalı, tibb, kimya, neft kimyası və s. geniş tətbiq edilir. Belə ki, layihədə iştirak edən şagirdlər 4 qrupda tədqiqat aparmışlar.

1-ci qrupda tədqiqat aparan şagirdlər Biləv alüminium süxurundan alüminiumun bəzi birləşmələrinin (alüminium-oksid, alüminium hidroksid, alüminium-sulfat və kalium-alüminium zəyi) alınmasını həyata keçirmişlər. onlar müəyyən etmişlər ki, Biləv alüminium süxurunun əsas

tərkibi (52,7%) alüminium-sulfat kristalhidratından ($Al_2(SO_4)_3 \cdot 18H_2O$) ibarətdir. Şagirdlər əldə etdikləri elmi biliklər əsasında məhlulda olan alüminium-sulfat duzunu kristallaşdırma metodu ilə ayırdılar. Bunun üçün məhlul əvvəlcə $H_2SO_4$ məhlulu ilə turşlaşdırılmış, qatlaşana kimi buxarlandırılmış və buzlu suda soyudulmuşdur. Çini kasada kristallaşan $Al_2(SO_4)_3 \cdot 18H_2O$ kristalhidratının çəkisi təyin edilmişdir. Süxurdan 76,4% çıxımla $Al_2(SO_4)_3 \cdot 18H_2O$ kristalhidratı alınmışdır (şək. 1). Müəyyən edildi ki, $Al_2(SO_4)_3 \cdot 18H_2O$ kristalhidratını $420^0$C temperaturda 3 saat müddətində gözərtdikdə kristallaşma suyunu tamamilə itirir. Qravimetrik metodla müəyyən edilmişdir ki, közərtmədən sonra susuz $Al_2(SO_4)_3$ 39,23% təşkil edir.



**Şəkil 1. $Al_2(SO_4)_3 \cdot 18H_2O$ kristalhidratı**

Şagirdlər Biləv alüminium süxurundan alınmış alüminium-sulfat kristalhidratından nümunə götürmüş isti suda həll edilmiş, sonra həcmi 100 ml-ə kimi durulaşdılar. Sonra həmin məhlulun üzərinə yavaş-yavaş 10%-li ammonium-hidroksid məhlulu əlavə etdilər. Onlar əyani olaraq məhlulda pH=8 olduqda tam çökmə baş verdiyini müşahidə etdilər. Alınmış ağ rəngli həlməşikvari alüminium hidroksid çöküntüsü süzgəc kağızı vasitəsilə süzülmüş, distillə suyu ilə yuyulduqdan sonra quruducu şkafda $100^0$C temperaturda 8 saat müddətində qurudulmuşdur. Bu zaman şagirdlərə aşağıdakı suallara tapmaq tapşırıldı:

1.Nə üçün alümimium hidroksid pH-ın yuxarı və aşağı qiymətlərində çökmür?

2.Alüminium hidroksidi yüksək temperaturda közərtsək nə baş verər?

Şagirdlər 1-ci suala tez cavab verdilər: cünki alümimium hidroksid amfoterdir, turş mühitdə müvafiq duzlar, əsasi mühitdə isə alüminatlar alınır. Bu duzlar isə suda yaxşı həll olur.

Şagirdlər 2-ci suala fərqli cavablar verdilər: bir qismi "parçalanır", digər qismi isə "əriyər" dedilər. Problemi həll etmək üçün şagirdlər tədqiqatı davam etdirməyə başladlır. Biləv alüminium süxurundan alınmış alüminium-hidroksiddən hazırlanmış nümunə çini butaya yerləşdirildi və Mufel sobasında $800^0$C temperaturda 2 saat müddətində közərdildi.

Közərtmə başa çatdıqdan sonra cini buta ekskatora yerləşdirildi və otaq temperaturuna kimi soyuduldu. Şagirdlər internetdən araşdırma apararaq müəyyən etdilər ki, alüminium-hidroksid $575^0$C-dən yuxarıda parçalanır. Tam parçalanma $780^0$C-də başa çatır və alüminium oksid alınır.

Onlar HİTACHİ TM3000 markalı skanedici elektron mikroskopunda (SEM) alüminium-hidroksidin və alüminium oksidin SEM şəkillərini çəkərək onların mikroquruluşlarını müqayisə etdilər (şək. 2).

Əyanilik şagirdlərdə tədqiqata böyük maraq yaratdı. Onlar kalium-alüminium zəyi almaq üçün Biləv alüminium süxurundan aldıqları $Al_2(SO_4)_3 \cdot 18H_2O$ kristalhidratını qaynar suda həll etdikdən sonra mühitin pH-ı 3 olana kimi sulfat turşusu əlavə etdilər.

Sonra onun üzərinə $KAl(SO_4)_2 \cdot 12H_2O$ birləşməsinin tərkibinə uyğun olaraq ekvimolyar miqdarda $K_2SO_4$ məhlulu əlavə edib qarışdırıldı. Alınmış məhlulu $100^0C$ temperaturda ifrat doymuş məhlul alınana kimi buxarlandırıldı. Qaynar məhlulu buzlu suda soyutduqda şəfaf rəngli $KAl(SO_4)_2 \cdot 12H_2O$ kristalları çökdüyü müşahidə olundu. Kristalları süzüb ayırdıqdan sonra süzgəc kağızı üzərində 24 saat müddətində (otaq temperaturunda) qurutdular. Sonra isə kalium-alüminium zəyinin SEM şəklini çəkdirlər (şək. 3).




alüminium hidroksid alüminium oksid

**Şəkil 2. Alüminium hidroksid və alüminium oksidin SEM şəkli**




**Şəkil 3. Kalium-alüminium zəyinin kristalları və SEM şəkli**

Aparılan müşahidələrdən aydın oldu ki, tədqiqat müasir təhsilə uyğun gələn zehni qabiliyyətlərin inkişafının universal vasitələrindən biridir.

Tədqiqat fəaliyyəti yaradıcı fəaliyyət formalarından biridir, buna görə də bilik və bacarığın formalaşdırılması şagirdlərin yaradıcı və zehni qabiliyyətlərinin inkişafı probleminin tərkib hissəsi kimi nəzərdən keçirilməlidir. Şagirdin müxtəlif bilik sahələrində müxtəlif müstəqil fəaliyyətlərə cəlb edilməsi əsasında onun intellektual və mənəvi inkişafı təhsilin inkişafının strateji istiqaməti sayıla bilər.

2-ci qrup şagirdlər Naxçıvan Muxtar Respublikası ərazisində olan mineral suların tərkibini analiz edərək suların codluğunu öyrəninmişlər. “Badamlı”, “Sirab” və “Vayxır” sularının minerallıq dərəcəsini, pH-nı və tətbiq sahələrini müəyyənləşdirmişlər. Şagirdlər Naxçıvan Muxtar Respublikasında

250-dən artıq mineral bulaqlar olduğunu, onların Şərqi Arpaçay, Naxçıvançay, Əlincəçay, Gilançay, Ordubadçay, Qaradərəçay və Şahbuzçay vadilərində olduğunu öyrəndilər. Bu bulaqların ən qədin geoloji süxurlardan çıxdığını söylədilər, qeyd etdilər ki, 1843-cü ildən başlayaraq bu suların tərkibi öyrənilməyə başlamışdır və bu sular 6 tipə, 16 sinfə və 33 növə ayrılmışdır.

Mineral suların tərkibini öyrənən şagirdlərin tədqiqat bacarığını müəyyən edərkən aşağıdakı nəticələrə gəlinmişdir:

1. Şagirdləri öz fikirlərini və ideyalarını formalaşdırmağa və dolayısı ilə ifadə etməyə həvəsləndirir;
2. Şagirdləri mövcud ideyalara zidd olan hadisələrlə üzləşdirir;
3. Şagirdləri fərziyyələr, təxminlər və alternativ izahatlar irəli sürməyə təşviq edir;
4. Şagirdlərə sərbəst və rahat bir mühitdə, xüsusən də kiçik qrup müzakirələri vasitəsilə öz fərziyyələrini araşdırmaq imkanı verir;
5. Şagirdlərə yeni anlayışları geniş spektrli hadisələrə və vəziyyətlərə tətbiq etmək imkanı verir ki, onların praktik əhəmiyyətini qiymətləndirə bilsinlər.

Buradan belə bir nəticəyə gələ bilərik ki, elmi tədqiqat öz mahiyyətinə görə dövri və uzunmüddətli daxili axtarış, elmi məlumatların dərin mənalı və yaradıcı işlənməsi, zehni proseslərin xüsusi analitik və proqnozlaşdırıcı xüsusiyyətləri rejimində işləməsi ilə əlaqəli aktiv idrak mövqeyini nəzərdə tutur.

3-cü qrup şagirdlər ekskursiya təşkil edərək bəzi mineral (boksid, maqnetit, gilllər, kvars, molibdenit və s.) nümunələri toplamış və onların tərkiblərinin araşdırılmışlar. Onlar bu minerallardan bəzi kationların ($Al^{3+}$, $Fe^{2+}$, $Fe^{3+}$, $Cu^{2+}$ və s.) çökdürülməsi şəraitini müəyyən etmişlər.

Şagirdlər ilk növbədə apardıqları nəzəri araşdırmalar haqqında məlumat verdilər. Onlar qeyd etdilər ki, Naxçıvan Muxtar Respublikası ərazisində 200-dən çox nadir, nəcib, qara və əlvan metallar, üzlük və bəzək daşları, divar daşı, kərpic və kirəmit gili, seolit, boksit, inşaat qumu, yol tikintisi və beton üçün çınqıl, sement və əhəng xammalı, daşduz, dolomit, gübrə xammalı, şüşə sənayesi xammalı yataqları aşkar edilmişdir.

1925-ci ildən Naxçıvan Muxtar Respublikasının mineral xammalının planlı şəkildə öyrənilməsinə başlanılıb və təbii ehtiyatlarla zəngin olan bu regionun geoloji quruluşu və faydalı qazıntıları haqqında yeni məlumatlar əldə edilmiş, məlum faydalı qazıntı yataqları yerləşən rayonların ilk geoloji xəritələri tərtib olunmuşdur. Bu faydalı qazıntı yataqlarının bir çoxunun perspektivliyi qiymətləndirilmiş, bəzilərinin isə kəşfiyyatı başa çatdırılaraq ehtiyat komissiyasına təhvil verilmişdir.

Bu qrupdakı müşahidələrimiz onu deməyə əsas verir ki, axtarış fəaliyyəti tədqiqat davranışının əsas mənbəyi və sürücüsü kimi çıxış edir. Onun motivasiya komponentini xarakterizə edir. Axtarış fəaliyyəti arzusu əsasən əvvəlcədən müəyyən edilir. Lakin bu keyfiyyət ətraf mühitin təsiri altında inkişaf edir.

Tədqiqat fəaliyyəti insan fəaliyyətinin bütün növlərinə nüfuz edir, idrak proseslərinin inkişafında, öyrənmədə, sosial təcrübənin mənimsənilməsində, sosial inkişafda və şəxsiyyətdə mühüm funksiyaları yerinə yetirir. Yəni, deyə bilərik ki, tədqiqat fəaliyyəti idrak fəaliyyəti ilə stimullaşdırılır, tədqiqat təfəkkürü ilə səciyyələnir və tədqiqat davranışında özünü göstərir.

4-cü qrup şagirdlər arsen (III) sulfid və sürmə (III) sulfid birləşmələrinin hidrokimyəvi çökdürülməsi və nanostrukturlarının formalaşdırılması şəraitinin tədqiqi ilə bağlı işlər yerinə yetirmişlər.

Onlar Darıdağ arsen və sürmə filizlərindən müvafiq olaraq arsen (III) sulfid və sürmə (III) sulfid birləşmələri almış onların xassələrini araşdırmışlar (şək. 4). Müxtəlif temperaturlarda bu birləşmələrin mikromorfologiyasını öyrənmişlər.




**Şəkil 4. Arsen (III) sulfid və sürmə (III) sulfid birləşmələrinin SEM şəkilləri**

Bütün layihələrin nəticələri dinlənilmiş və müzakirə aparılmışdır. Sonda elmi tədqiqat işlərinin metodologiyası müəyyənləşdirilmişdir. Belə ki, elmi tədqiqat işlərinin təşkili üçün aşağıdakı mərhələləri əhatə edən metodologiya işləyib hazırlanmışdır: hazırlıq, planlaşdırma, tədqiqat informasiyanın toplanması və aralıq problemlərin həlli, nəticələrin təqdimatı, nəticənin və prosesin qiymətləndirilməsi (şək. 5).



**Şəkil 5. Şabahın tədqiqatçıları layihəsində iştirak edən şagirdlər**

Nəticələrin təhlili göstərir ki, elmi-tədqiqat işi 1-ci qrupda ~67%, 2-ci qrupda ~72%, 3-cü qrupda ~69%, 4-cü qrupda isə ~75% yerinə yetirilmişdir.

Yuxarıdakı mərhələləri yerinə yetirərkən şagirdlər əvvəlcə mövcud biliklər haqqında məlumatların toplamış və ümumiləşdirmişdir. Tədqiqat mövzusu üzrə xülasə icmalı tərtib edilmişdir.

Bu zaman şagirdlərdə tədris ədəbiyyatı ilə işləmək, sorğu kitabçalarından və cədvəllərdən istifadə etmək bacarığı formalaşmışdır. Mövcud biliklərin təhlili və tənqidi qiymətləndirilməsi, tədqiqat mövzusunun qismən və ya tamamilə araşdırılmamış tərəflərinin müəyyənləşdirilməsi əsasında tədqiqat planlaşdırılması həyata keçirilmişdir. Mövzular üzrə analitik icmal tərtib edilmiş,

tədqiqat problemi və konkret tapşırıqlar verilmişdir. Bunun əsasında şagirdlər nəzəri və eksperimental tədqiqatlar aparılmışdır.

Nəticədə şagirdlər yeni biliklər əldə etmək və problemi həll etmək bacarığına yiyələnmişdir. Görülən işləri və əldə edilən nəticələri təsvir edən elmi mətn tərtib edilmişdir. Sonda hər bir tədqiqat işinin nəticələrinin tədqdimatı və qiymətləndirilməsi aparılmışdır.

Müəyyən edilmişdir ki, axtarış və tədqiqat bacarığı şagirdə özünü dərk etməyə imkan verir. Məhz bu hal onu ilk gündən elmi problemlərin həlli prosesində fəal iştirak etməyə sövq edir. Şagird müstəqil fəaliyyət göstərmək qabiliyyətlərinin genişlənməsi onda təkcə qərar qəbul etmə prosesinə deyil, həm də nəticələrə maraq yaradır (Əliyev, Cabbarov, 2008).

Əldə edilən nəticələr tədqiqat işi tədqiqat bacarığını inkişaf etdirmək vasitəsi kimi xidmət edə biləcəyi fərziyyəmizi təsdiqləyir. Məhz sistemli yanaşma ilə, tədqiqat fəaliyyətini artırmaqla təhsil və idrak səriştəsi kimi mürəkkəb, çoxkomponentli səriştəni formalaşdırmaq mümkündür.

Müəyyən edilmişdir ki, tədqiqat fəaliyyəti tədris işinə rəngarənglik gətirir, yorğunluğu aradan qaldırır, diqqəti, zəkanı, müstəqilliyi inkişaf etdirir, fənnə marağı artırır. Təcrübə göstərir ki, şagirdlərin tədqiqat bacarıqlarının inkişafı üzrə məqsədyönlü və sistemli iş aşağıdakılara kömək edir (Əlizadə, 1998):

1) təhsil fəaliyyətinin motivasiyasını gücləndirir;
2) elmi-tədqiqat fəaliyyətində texnologiyalardan istifadə ilə əlaqədar tədris prosesinin keyfiyyətini artırır;
3) şagirdlərin kimyaya marağının artırılr;
4) bilik əldə etmək fəaliyyətlərində müstəqilliyi inkişaf etdirir;
5) şagirdlərin intellektual inkişafını artırır.

## Nəticə

Nəticə etibarı ilə, kimyanın dərindən öyrənilməsi ilə təşkil olunan tədqiqatlar sistemi təkcə ümumi və qeyri-üzvi kimya üzrə biliklərin mənimsənilməsinə deyil, həm də üzvi və analitik kimya üzrə biliklərin yenilənməsinə kömək edir. Bu şagirdlərdə elmi-tədqiqat bacarıqlarının səviyyəsinin artırılmasına, xüsusən də təcrübəni ümumiləşdirmək, layihələndirmək və onun nəticələrini təhlil etmək bacarığı yaradır. Bununla da bilik və praktiki hərəkətlərin daha şüurlu mənimsənilməsinə nail olunur.

## Ədəbiyyat


1. Bataeva, E.V. (2004). Formirovanie issledovatelskikh umeniy. Khimiya v shkole. №1, s.22-27.
2. Besedina, L.L. (2012). Issledovatelskaya deyatelnost kak sredstvo formirovaniya klyuchevikh kompetensiy. Khimiya v shkole. №7, s.21-25.
3. Fedorov, A.G., Metelev, S.E., Solovev, A.A., Shlyukova, E.V. (2012). Kompetentnostniy podkhod v obrazovatelnom prosesse (monoqrafiya). Omsk, 167 s.
4. Iodko, A.Q. (1983). Formirovanie u uchashixsya issledovatelskoy deyatelnosti v prosesse obucheniya ximii: avtoref. dis. kand. ped. nauk. Minsk, 17 s.
5. Veysova, Z. (2013). Dərs və onun quruluşu haqqında. “Kurikulum” jurnalı. № 2, s.105-108.
6. Podkopaeva, I.N. (2010). Organizachiya i provedenie uroka-issledovaniya. Khimiya v shkole. № 4, s.16-24.
7. Stepanova, M.V. (2005). Uchebno-issledovatelskaya deyatelnosti shkolnikov v profilnom obuchenyy: Uchebno-metodicheskoe posobie dlya uchiteley. Pod red. A.P.Tryapinoy, SPb., KARO, 96 s.
8. Mehrabov, A. (2013). Müasir dərs: onun təşkilinə və gedişinə qoyulan tələblər. “Kurikulum” jurnalı, № 4, s.5-10.
9. Əliyev, B.H., Əliyeva, K., Cabbarov, R. (2011). Pedaqoji psixologiya. Bakı.
10. Həmzəyev, M.Ə. (1991). Pedaqoji psixologiya. Bakı.

11. Hukina, G.I. (1986). Rol deyatelnosti v uchebnom prosesse: kn. dlya uchitelya. M., Prosveshenie, 144 s.
12. Zagranisnaya, N.A., Ivanova, R.G. (2010). Sovremennie podkhodi k obuseniyu khimyy. Khimiya v shkole. №2, s.10-15.
13. Əliyev, B.H., Cabbarov, R.V. (2008). Təhsildə şəxsiyyət problemi. Bakı.
14. Əlizadə, Ə.Ə. (1998). Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı.

Göndərilib: 08.12.2023 Qəbul edilib: 26.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/28-33

**Əlöysəd Əsgərov**
Azərbaycan Dövlət Aqrar Universiteti
iqtisad üzrə fəlsəfə doktoru
alovsad.asgarov@mail.ru
**Bəsti Novruzova**
Azərbaycan Dövlət Aqrar Universiteti
elekberlimehemmed@mail.ru

# MÜƏSSİSƏLƏRİN MALİYYƏ SİYASƏTİ

**Xülasə**

Müəssisənin (təşkilatın) maliyyəsi ümumilikdə maliyyə sisteminin əsas həlqəsidir. İctimai istehsal sferasına xidmət etmə xüsusiyyətinə görə maddi istehsal sahələrinin müəssisələrinin maliyyəsi və qeyri-istehsal sahələri təşkilatlarının maliyyəsi bir-birindən fərqlənir. Mülkiyyət formasından asılı olaraq müəssisənin maliyyəsi dövlət müəssisələrinin maliyyəsi və qeyri-dövlət müəssisələrinin (xüsusi, kooperativ, birgə müəssisələr) maliyyəsinə bölünür. Bütün bu münasibətlərdən aydın olur ki, müəssisələrin maliyyəsinin zəruriliyi əmtəə-pul münasibətlərinin mövcudluğu və dəyər qanununun fəaliyyəti ilə sıx surətdə əlaqədardır. Müəssisənin maliyyəsinin bölüşdürücü funksiyası vasitəsilə ictimai məhsulun, ümumi gəlirin, müəssisənin sərəncamında qalan mənfəətin bölgüsü, məqsədli pul fondlarının, əsas və dövriyyə vəsaitlərinin, amortizasiya fondunun yaradılması və istifadəsi həyata keçirilir.

***Açar sözlər:*** *müəssisənin maliyyəsi, mənfəət, amortizasiya fondu, gəlir, xərc, pul fondları, büdcədənkənar fond*

**Aloysad Asgarov**
Azerbaijan State Agrarian University
PhD in economics
alovsad.asgarov@mail.ru
**Basti Novruzova**
Azerbaijan State Agrarian University
elekberlimehemmed@mail.ru

## Financial policy of enterprises

**Abstract**

Enterprise (organization) finance is the main link of the financial system in general. Due to the feature of serving the social sphere of production, the finance of enterprises of material production areas and the finance of organizations of non-production areas differ from each other. Depending on the form of ownership, the finance of the enterprise is divided into the finance of state enterprises and the finance of non-state enterprises (private, cooperative, joint enterprises). It is clear from all these relationships that the necessity of enterprise finance is closely related to the existence of commodity-money relations and the operation of the law of value. Through the distributive function of the enterprise's finances, the distribution of the public product, total income, profit remaining at the disposal of the enterprise, the creation and use of special funds, fixed and circulating funds, depreciation fund is carried out.

***Keywords:*** *enterprise finance, profit, amortization fund, income, expenditure, cash funds, off-budget fund*

## Giriş

Müəssisə dedikdə mənfəət əldə etmək və ictimai tələbatı odemek məqsədi ilə təsərrüfat fəaliyyətini həyata keçirmək üçün yaradılan müstəqil təsərrüfat subyekti başa düşülür. Xüsusi təsərrüfat maliyyəsi təsərrüfatçılıq subyektlərinin gəlirlərinin formalaşması və istifadəsinin spesifikliyi ilə əlaqədar aşağıdakı həlqələri (elementləri) özünə daxil edir. İctimai istehsal sferasına xidmət etmə xüsusiyyətinə görə maddi istehsal sahələrinin müəssisələrinin maliyyəsi və qeyri-istehsal sahələri təşkilatlarının maliyyəsi bir-birindən fərqlənir. Mülkiyyət formasından asılı olaraq müəssisənin maliyyəsi dövlət müəssisələrinin maliyyəsi və qeyri-dövlət müəssisələrinin (xüsusi, kooperativ, birgə müəssisələr) maliyyəsinə bölünür (Makkonnell, Stenli, Bryu, 2009).

Müəssisənin maliyyəsinin təşkilinin əsasını maliyyə planı təşkil edir. Maliyyə planının forması gəlir və xərclər balansıdır ki, burada müəssisənin maliyyə-təşkilat fəaliyyətinin nəticələri, onun büdcə, büdcədənkənar fondlar və bank ilə qarşılıqlı əlaqəsi öz əksini tapır.İnvəstisiya fəaliyyətində heç bir firma maliyyələşdirməyə və son maliyyə nəticəsi ilə əsaslandırılmış layihə (plan) işləyib hazırlamadan işə başlaya bilməz. Firmadaxili planlaşdırma əsasında müqavilələr bağlanır, müsabiqə əsasında sifarişlər yerləşdirilir. Planların işlənib-hazırlanması (xaricdə onları layihə adlandırırlar) istehlakçıların tələbatının dərindən öyrənilməsinə, rəqiblərinin təcrübəsinin öyrənilməsinə, müəssisənin maliyyə imkanlarının təhlilinə əsaslanır. Yaxşı hazırlanmış plan kommersiya hesabının müsbət nəticələrinə xidmət edir.

Müəssisə dedikdə mənfəət əldə etmək və ictimai tələbatı ödemek məqsədi ilə təsərrüfat fəaliyyətini həyata keçirmək üçün yaradılan müstəqil təsərrüfat subyekti başa düşülür.

Azərbaycan Respublikasının Mülki Məcəlləsinə əsasən təşkilati-hüquqi əlamətlərinə görə müəssisə və təşkilatlar kommersiya və qeyri-kommersiya təşkilatlarına ayrılır (Ataşov, Novruzov, İbrahimov, 2014).

İqtisadi kateqoriya kimi müəssisənin maliyyəsi dedikdə müəssisə tərəfindən pul vəsaitləri fondlarının formalaşması, bölgüsü (yenidən bölgüsü) və istifadəsi, habelə onların mərkəzləşdirilmiş fondların formalaşması və istifadəsi ilə əlaqədar iqtisadi (pul) münasibətlərini ifadə edir.

Maliyyənin əsas əlamətlərindən biri onların pul formasında ifadəsi və maliyyə münasibətlərinin pul vəsaitinin real hərəkəti vasitəsilə əks olunmasıdır (Zeynalov, 2008).

Maliyyənin mahiyyəti onun funksiyalarında təzahür edir. Müəssisələrin maliyyəsi üç funksiyanı – bölüşdürücü, nəzarət və təkrar istehsal funksiyasını yerinə yetirir.

Müəssisənin maliyyəsinin bölüşdürücü funksiyası vasitəsilə ictimai məhsulun, ümumi gəlirin, müəssisənin sərəncamında qalan mənfəətin bölgüsü, məqsədli pul fondlarının, əsas və dövriyyə vəsaitlərinin, amortizasiya fondunun yaradılması və istifadəsi həyata keçirilir (Sadıqov, Bədəlov, 2003).

Müəssisənin maliyyəsinin nəzarət funksiyası gəlirlərin formalaşdırılmasına, müəssisələrin məsrəflərinə, pul fondlarının səmərəli istifadə edilməsinə, büdcəyə vergilərin ödənilməsinə, büdcədənkənar sosial fondlara ayırmalara nəzarət edilməsində təzahür edir. Maliyyə nəzarəti pul fondlarının məqsədli təyinatı üzrə istifadəsi prosesində həyata keçirilir.

Müəssisənin təkrar istehsal funksiyası istər ayrı-ayrı müəssisələrdə və istərsə də bütövlükdə iqtisadiyyatda vəsaitlərin daim dövriyyəsini təmin edir. Bu funksiyanın yerinə yetirilməsi vasitəsi ilə müəssisənin maliyyəsi ümumi iqtisadiyyatın inkişaf tempinə, onda formalaşmış proporsiyalara, sahə və ərazi strukturlarının təkmilləşdirilməsinə təsir göstərir (Zeynalov, 2008).

Kommersiya müəssisələrinin maliyyəsinin təşkili onların təsərrüfat fəaliyyətinin təşkili xüsusiyyətlərinin əsaslanır.

Kommersiya müəssisələrində (təşkilatlarında) xüsusi maliyyə resurslarının ilkin formalaşması müəssisənin təsis edilməsi anında – yəni, nizamnamə fondu yarandığı vaxt baş vərir. Təsərrüfat subyektinin təşkilati-hüquqi formasından asılı olaraq, nizamnamə kapitalın əmələ gəlmə mənbəyi aşağıdakılar ola bilər: səhmdar kapital (səhmdar təşkilatlarında); uzunmüddətli kredit, büdcə vəsaitləri və digər mənbələr. Fəaliyyətdə olan müəssisələrdə maliyyə resurslarının əsas mənbəyi məhsul (iş və xidmət) satışından daxilolmalar təşkil edir ki, onun da hesabına gəlir və mənfəət, habelə amortizasiya, ehtiyat və digər pul fondları yaradılır (Sadıqov, Hüseynov, Zeynalov, 2007).

Kommersiya təşkilatlarının pul gəlirləri məhsul (iş və xidmət) satışından, digər əmlakların satışından (əsas fondların, invəntarların, qeyri-material aktivlərinin və s.) daxilolmalardan; satışdankənar gəlirlərdən, icarə haqqından əmələ gəlir.

Pul gəlirlərinin başlıca mənbəyi məhsul (iş və xidmət) satışından daxilolmalardan ibarətdir. Onun həcmi məhsul satışının həcmi və qiyməti ilə müəyyən edilir. Öz növbəsində məhsul (iş və xidmət) satışının həcmi isə bazarın tələbindən, bazarda tələb və təklifdən asılıdır (Məmmədov, 2021).

**Məhsul satışından mənfəət ümumi mənfəətə (balans mənfəəti) və xalis mənfəətə bölünür.** Kommersiya təşkilatlarında mövcud qiymətlərlə (ƏDV və aksizsiz) məhsul (iş və xidmət) satışından daxil olan gəlirləri ilə onun istehsalı və satışına çəkilən xərclərin məbləği arasındakı fərq kimi hesablanır.

Ticarət müəssisəsində əmtəələrin satışından mənfəət satış pulu – netto məbləği ilə (ƏDV, digər vergiləri çıxmaqla satış pulu) reallaşdırılmış əmtəələrin qalıq dəyəri və satılmış əmtəələrin tədavül xərcləri məbləği (ümumtəsərrüfat xərcləri nəzərə alınmaqla) arasındakı fərq kimi müəyyən edilir.

Balans mənfəəti – satışdan əldə olunan mənfəət ilə satışdan kənar mənfəətin ümumi həcmini göstərir. Beləliklə, balans mənfəəti təşkilatın bütün təsərrüfat fəaliyyətinin nəticələrini əks etdirir (8):

$$Mb = Mms + Məs + Gsk$$

burada: Mb – balans mənfəəti,

Mms – məhsul satışından mənfəət,

Məs – əsas vəsaitlərin və digər əmlakın satışından mənfəət,

Gsk – satışdankənar gəlirlər (saldo).

Əmlakın satışından (əsas vəsait və digər əmlak) mənfəət əmlakın satışından daxilolmalarla (ƏDV çıxmaqla) inflyasiya əmsalına korrektə edilmiş qalıq dəyəri (balans üzrə) arasındakı fərq kimi müəyyən edilir.

Balans mənfəəti istehsalın səmərəliliyinin qiymətləndirilməsi, müəyyən dövrdə onun artım dinamikasını aşkar etmək, ümumi rentabelliyi təmin etmək üçün istifadə olunur.

**Xalis mənfəət** – bütün vergi və rüsumları ödədikdən sonra müəssisənin (təşkilatın) sərəncamında qalan, istehsalın inkişafına, pul fondlarının yaradılmasına və sosial ehtiyaclara istifadə edilən mənfəətdir.

1992-ci ildən Azərbaycan Respublikasında kommersiya müəssisə və təşkilatlarının balans mənfəətinin bölgüsü aşağıdakı sxem üzrə həyata keçirilir (Frederik, Mişkin, 2021: 700).




Mənfəət nəinki maliyyə-təsərrüfat fəaliyyətinin başlıca nəticəsi kimi, həm də müəssisənin özünün və bütövlükdə dövlətin müxtəlif tələbatlarının ödənilməsi mənbəyi kimi çıxış edir.

Müəssisələrdə mənfəətin bölgüsünə qoyulan başlıca tələb istehlaka və yığıma yönəldilən pul vəsaitləri arasında müəyyən edilmiş optimal nisbət əsasında geniş təkrar istehsalın ehtiyaclarını maliyyə resursları ilə təmin etməkdən ibarətdir.

Mənfəətin bölüşdürülməsi daha geniş sosial-iqtisadi mahiyyət daşıdığına görə o təkcə müəssisənin daxili problemi deyildir. Mənfəətin iqtisadi cəhətdən əsaslandırılmış bölgüsü sistemi ilk növbədə dövlət qarşısında olan maliyyə öhdəliklərinin yerinə yetirilməsini və müəssisənin istehsal-material və sosial ehtiyaclarını təmin etməlidir (Məmmədov, Zeynalov, 2007).

Təsərrüfatların ixtiyarı var ki, məqsədli ehtiyaclar üçün təmir fondu, valyuta fondu, ehtiyat fondu və s. yaratsınlar.

Müəssisənin yığım və istehlak fondları vəsaitlərinin hamısı smeta üzrə sərf edilir. Smetanın layihəsi təsərrüfatın əmək kollektivinə müzakirə üçün vərilir, o qəbul edildikdən sonra həmkarlar komitəsi və rəhbərliyin birgə qərarı ilə təsdiq edilir. Smetadan istifadə haqqında rəhbərlik və həmkarlar komitəsi əmək kollektivinə məlumat verir. Fond vəsaitinin qalığı götürülmür, növbəti ildə təsdiq edilmiş smetaya uyğun istifadə edilir. Müəssisənin yığım və istehlak fondlarının vəsaitləri təsərrüfatın hesablaşma hesabında saxlanır (Sadıqov, Hüseynov, Zeynalov, 2007).

Fondların plan və faktiki həcmini təsərrüfat müəyyən edir. Hansı həcmdə fond vəsaiti varsa, o qədər də sərf etmək olar. İcazə verilmir ki, gələcək ayırmalar hesabına xərclər edilsin. İstehsalın, elm və texnikanın inkişafı və sosial inkişaf fondu vəsaitində çatışmazlıq olduqda bank kreditindən istifadə etmək olar. Təsərrüfatların hamısı yığım və istehlak fondlarını ilin yekun işləri üzrə yaradırlar (Kərimov, Babayev, 2007).

Kənd təsərrüfatı müəssisələri bununla yanaşı xüsusi yığım və istehlak fondlarını yaratmayaraq, onların sərəncamında qalan vəsaitlərdən istifadəsi üçün ümumi smeta tərtib edirlər.

İnvestisiya – gəlir (mənfəət) və ya sosial səmərə əldə etmək məqsədilə sahibkarlıq və digər fəaliyyət növləri obyektlərinə qoyulan maliyyə vəsaitindən, habelə maddi və intelektual sərvətlərdən ibarətdir.

İnvestisiya obyektlərinə qiymətli kağızlar (səhmlər, istiqrazlar və s.), iqtisadiyyatın bütün sahələrində yeni yaradılan və modernləşdirilən əsas fondlar və dövriyyə vəsaitləri, məqsədli pul əmanətləri, elmi-texniki məhsul və mülkiyyətin digər obyektləri, əmlak hüququ və intellektual mülkiyyət hüququ aid edilir.

İnvestisiya fəaliyyəti subyektləri (investorlar) hasilat, tikinti, innovasiya və maliyyə kapitalı dövriyyəsi siferasına daha çox diqqət yetirirlər. İnvestisiyalaşmanın əsas istiqamətləri kimi aşağıdakıların fərqləndirilməsi məqsədəuyğundur. İstehsalın genişləndirilməsinə, istehsal infrastrukturunun inkişafına, modernləşdirməyə, material ehtiyatlarının artırılmasına, sosial infrastrukturunun inkişafına, elmə, kadr hazırlığına investisiyalar (Abbasov, 2005).

İnvestisiya proseslərin əsas kapitalın artırılması və yeniləşdirilməsi, innovasiyalı inkişafı, sturuktur təkmilləşmələrinin həyata keçirilməsinə və istehsalın səmərəliyini yüksəldən digər bu kimi vəzifələrin icrasına yönəldilir.

Ümumiyyətlə, investisiya qoyuluşlarını gələcəkdə gəlir əldə etmək üçün bu gün pul vəsaitlərinin maddi aktivlər və ya qiymətli kağızlar əldə edilməsinə sərfi kimi xarakterizə etmək olar və xarakteristikadan bəllidir ki, investisiyalar real və maliyyə investisiyalarına bölünür.

Maliyyə investisiyaları – səhm, istiqraz, opsion və s. qiymətli kağızlar alqısı ilə bağlıdır (Conatan, 2021: 896).

**İnvestisiyaların təsnifatı**




İvestisiya qoyuluşunun maliyyələşdirilməsi mənbələri – xüsusi borc və büdcə vəsaitlərinə ayrılır. Maliyyələşdirilməsi mənbələrindən asılı olaraq invəstisiya qoyuluşu mərkəzləşdirilmiş və mərkəzləşdirilməmiş qoyuluşlara ayrılır. Mərkəzləşdirilmiş invəstisiya qoyuluşu əsasən büdcə vəsaiti hesabına yerinə yetirilir. Xüsusilə də sahələrarası istehsalın inkişafına yeni tikintiyə və s. yönəldilir. Mərkəzləşdirilməmiş invəstisiya qoyuluşu isə xüsusi vəsait və bank krediti hesabına yerinə yetirilir.

İnvestisiya qoyuluşunun maliyyələşdirilməsinin xüsusi mənbələrinə aiddir: mənfəətdən bu məqsədə ayırma; səhm buraxılışından səfərbər edilən vəsait; icarə haqqı əsaslı tikintidən daxili resursların səfərbər edilməsi; əsas istehsal fondları üçün nəzərdə tutulan amortizasiya ayırması; artıq və lazımsız əsas fondların satışından gəlir; məhsuldar və iş heyvanlarının çıxdaş edilməsindən gəlir və s. (14).

İnvestisiya qoyuluşunun maliyyələşdirməsi mənbələrindən ən əsaslısı amortizasiya ayırmasıdır.

Əsas fondların təzələnməsi ilə əlaqədar olan xərclərin ödənilməsinin, müəssisənin özünü maliyyələşdirilməsinin əsas mənbəyi müəssisənin xüsusi vəsaitidir. Bu vəsait əsas fondların bütün xidməti müddətində amortizasiya ayırmaları şəklində yığılır. Amortizasiya ayırmaları müəssisənin öz maliyyə resursları içərisində başlıca yer tutur.

Amortizasiya əsas fondların fiziki və mənəvi aşınmasının pul ilə ifadəsidir. Amortizasiya əsas fondlar sıradan çıxdıqda onları tam dəyişmək məqsədilə həyata keçirilir. Məhsul satışından əldə edilən gəlirin bir hissəsi (amortizasiya ayırmaları həcmində) amortizasiya fonduna daxil olur (Bağırov, Həsənli, 2011: 184).

Amortizasiya fondu – əsas istehsal fondlarının amortizasiya ayırmaları hesabına formalaşır və köhnəlmiş əsas fondların bərpasına və yeni əsas fondların alınmasına yönəldilən pul vəsaitidir.

Amortizasiya ayırmalarının məbləği məhsulun istehsal xərclərinə (maya dəyərinə) daxil edilir və bununla da məhsulun qiymətinin üzərinə keçir. Müəssisə amortizasiya ayırmaları məbləğini yığmağa borcludur. Bu baxımdan müəssisə həmin məbləği məhsulun satış pulundan ayıraraq amortizasiya fonduna keçirməlidir. Müəssisənin illik amortizasiya ayırmalarının kəmiyyəti əsas fondların dəyərindən, onun tərkibindən və amortizasiya normasından asılıdır (Novruzov, Hüseynov, 2007).

Amortizasiya hər ay hesablanır, yəni daimi və fasiləsiz xarakter daşıyır. Fondun vəsaiti dövri olaraq xərclənir yəni vəsaitin xərclənməsi normativ xidmət müddətinin başa çatması ilə əlaqədar onların təkrar istehsalı prosesində həyata keçirilir. Bu anadək həmin vəsaitlər azad olur və əsas fondların təkrar istehsalı üçün maliyyə resursları mənbəyi kimi istifadə edilə bilər.

Amortizasiya ayırmaları sistemində əsas problemlərdən biri də amortizasiya ayırmaları normalarının təkmilləşdirilməsi, əsas fondların, xüsusən onların aktiv hissəsinin – maşın və avadanlıqların sürətli amortizasiya metodundan istifadə edilməsidir (Ataşov, Novruzov, İbarhimov, 2009: 85).

Amortizasiya ayırmalarının məbləği amortizasiya normasına görə müəyyən edilir. Amortizasiya norması əsas fondların hazır məhsulun üzərinə hər il keçirilən hissəsini əks etdirir. Amortizasiya norması aşağıdakı düsturla hesablanır:

$$A_n = \frac{Fİ - FL}{TN \times Fİ} \cdot 100$$

burada, $A_n$ – amortizasiya norması;
Fİ – əsas fondların ilk dəyəri, man.;
FL – əsas fondların ləğv etmə dəyəri, man.
TN – əsas fondların normativ xidmət müddətidir (amortizasiya müddəti), il.

## Nəticə

Amortizasiya normasının səviyyəsi əsas fondların aşınmış hissəsinin bərpa edilməsi üçün lazım olan resursların həcmini müəyyən edir. Amortizasiya normasının köməyilə əsas fodların dövretmə sürəti tənzimlənir, onların təkrar istehsalı prosesi intensivləşdirilir. Amortizasiya norması və əsas fondların qrupları üzrə bu normaların diferensiallaşdırılması vasitəsilə müəssisədə texniki və istehsal siyasəti həyata keçirilir.

## Ədəbiyyat

1. Makkonnell, I., Stenli, L., Bryu. (2009). Ekonomiks, 19 – izdaniye.
2. Ataşov, B., Novruzov, N., İbrahimov, E. (2014). Maliyyə nəzəriyyəsi. Bakı.
3. Zeynalov, V.D. (2008). Maliyyənin əsasları. Bakı.
4. Sadıqov, M.M., Bədəlov, Q. (2003). Maliyyə resursları və maliyyə bazarı. Bakı.
5. Zeynalov, V.D. (2008). Beynəlxalq maliyyə. Bakı.
6. Sadıqov, M., Hüseynov, A., Zeynalov, V. (2007). Korporativ maliyyə. Bakı.
7. Məmmədov, S.M. (2021). Rəqəmsal keçid və elmi texnoloji inkişafın sürətləndirilməsi zəruriliyi. Bakı.
8. «İnvestisiya fəaliyyəti haqqında» Azərbaycan Respublikasının Qanunu.
9. Frederik, S., Mişkin. (2021). Pul, bank və maliyyə bazarlarının iqtisadiyyatı. Bakı: TEAS Press Nəşriyyat evi, 700 s.
10. Məmmədov, Z.F., Zeynalov, V.Z. (2007). Maliyyə pul tədavülü və kredit. Bakı.
11. Kərimov, A.E., Babayev, A.A. (2007). Qiymətli kağızlar bazarı. Bakı.
12. Abbasov, A.N. (2005). Qiymətli kağızların formalaşması və inkişafı. Bakı.
13. Conatan, Q. (2021). Dövlət maliyyəsi və dövlət siyasəti. Bakı: Worth Publishers, TEAS Press Nəşriyyat evi, 896 s.
14. https://agroeconomics.az/az/article/34/isgaldan-azad-olunan-erazilerimizde-kend-teserrufa/
15. Bağırov, D., Həsənli, M. (2011). Bakı: Maliyyə, 184 s.
16. Novruzov, N.A., Hüseynov, X.Ə. (2007). Bakı: Maliyyə.
17. Ataşov, B.X., Novruzov, N.A., İbarhimov, E.Ə. (2009). Müəssisənin maliyyısi. Bakı, 85 s.

Göndərilib: 30.11.2023 Qəbul edilib: 03.02.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/34-41

**Nərgiz Paşazadə**
Azərbaycan Dillər Universiteti
dissertant
nargiz_pashazadeh_786@mail.ru

# KONSEPTİN MAHİYYƏTİ VƏ QƏHRƏMANLIQ KONSEPTİNİN İNGİLİS ATALAR SÖZLƏRİNDƏ REALİZƏSİ

**Xülasə**

Son illərdə konseptin mahiyyətinə və strukturuna ciddi diqqət yetirilir. Lakin bu məsələ ilə bağlı hələ də tam aydınlıq və konsensus yoxdur. Bu, ilk növbədə, konseptin mental hadisə olması və onun linqvistik vasitələrlə təzahür etməsi ilə bağlıdır. Konsept ilkin olaraq hisslər vasitəsilə qavrayış nəticəsində cisimlərin təsvirləri (əksləri) şəklində meydana çıxır, sonra tədricən mürəkkəbləşir, yəni inkişaf edir, dəyişir, tamamlanır. Ona görə də konkret "ad"la konsepti tam qəbul edib həyata keçirmək mümkün deyil. Konsept hər bir konkret halda müvafiq linqvistik vasitələrlə həyata keçirilir. Tədqiqatçılar konseptin çoxkomponentli strukturunu qeyd edərək, onun nüvəsini və periferiyasını fərqləndirirlər. Nüvəyə konseptin məzmununu tam şəkildə reallaşdıran əlamət və xüsusiyyətlər, periferiyaya isə nüvə ilə nisbətən zəif bağlı olanlar daxildir.

Mədəni konnotasiyalı konseptin mənası bir sıra linqvistik vasitələrlə həyata keçirilir. Onların arasında xalqın dünyagörüşünü, bu və ya digər hadisəyə münasibətini ifadə edən atalar sözləri xüsusi yer tutur. Atalar sözləri xalqın tarixi-mədəni yaddaşının bir növ saxlancıdır və konkret etnomədəni birliyin məişət yaddaşına əsaslanır.

Bu məqalədə ingilis atalar sözlərində qəhrəmanlıq konsepti araşdırılaraq qəhrəmanlığın vəziyyətin tələb etdiyi zaman özünü büruzə verdiyi təhlil olunub. Qəhrəmanlıq haqqında atalar sözləri qədim zamanlarda yaranmışdır. Lakin onlar bu gün də dil praktikasında aktualdır.

***Açar sözlər:*** *konsept, atalar sözləri, qəhrəmanlıq, cəsur, qoçaq, milli şüur, etnosun konseptosferi*

**Nargiz Pashazada**
Azerbaijan University of Languages
PhD student
nargiz_pashazadeh_786@mail.ru

# The essence of the concept and implementation of the concept of heroism in English proverbs

**Abstract**

In recent years, close attention has been paid to the essence and structure of the concept. At the same time, there is still no complete clarity and consensus on this issue. This is due, first of all, to the fact that the concept is a mental phenomenon and it manifests itself only indirectly, through linguistic means. The concept initially appears in the form of images of objects as a result of perception through the senses, then it gradually becomes more complicated, i.e. develops, changes. Therefore, it is completely embraced and it is impossible to implement the concept with a specific "name". The concept is implemented in each specific case in a specific manifestation by appropriate linguistic means. Researchers note the multicomponent structure of the concept, highlighting the core and periphery in it. The core includes signs and features that most fully realize the content of the concept, and those that are relatively weakly connected with the core belong to the periphery.

The meaning of the concept with cultural connotation is realized by a number of linguistic means. Among them are proverbs that carry the worldview of the people, their attitude to this or that phenomenon. Proverbs are a kind of repository of the historical and cultural memory of the people and are based on the everyday memory of a particular ethno-cultural community. This article

discusses the implementation of the concept of heroism in English proverbs, based on them, it can be argued that heroism manifests itself when the situation that has arisen requires it. Proverbs about heroism appeared in ancient times. But they are still relevant in language practice today. To designate a heroic hero, they compare it with a strong animal. To accomplish the heroic, such qualities as self-confidence, overcoming one's fear of the unknown, will, determination, etc. are necessary, which can be seen in the example of English proverbs.

***Keywords:*** *concept, proverbs, heroism, brave, courageous, national consciousness, ethnos concept-sphere*

## Giriş

Konseptin mahiyyəti və strukturu haqqında son illərdə çoxsaylı fikirlər söylənilməsinə baxmayaraq, onların heç biri bizə konsepti mahiyyətini tam anlamağa və onun haqqında bitkin təsəvvür əldə etməyə imkan vermir. Konsept ətraf aləmin əşya və hadisələri haqqında informasiyaların sadəcə saxlanc yeri deyil. Böyük ehtimalla. O, müəyyən şəkildə strukturlaşmışdır. Onun strukturu haqqında söhbət gedəndə tədqiqatçılar ən müxtəlif fikirlər söyləyir, müxtəlif obrazlara müraciət edirlər.

Mövcud yanaşmaların heç biri konseptin strukturunu, onun tərkibində müxtəlif «adlar» altında fərqləndirilən struktur hissələrini yetərincə dolğun əks etdirməyə qabil deyil, çünki konseptin özündə ehtiva etdiyi tərkib elementlərinin hər biri sxematik təsvir oluna bilәndən qat-qat mürəkkəbdir. Konseptlərin, xüsusilə də mədəni konseptlərin (halbuki bu anlayışın özü də birmənalı anlaşılmaya gəlmir: mədəni olmayan konseptlər varmı? onlar hansı xüsusiyyətləri ilə fərqlənirlər? və s. kimi suallar yaranır) əksəriyyəti daha çoxsaylı hissələrə bölünə bilir.

Konseptin strukturunu dərk və sonra izah etmək, bu zaman onu təşkil edən «elementləri» dəqiq fərqləndirmək və yerini müəyyənləşdirə bilmək üçün əvvəlcə, fikrimizcə, onun mahiyyəti, formalaşma mexanizmi və imkan daxilində realizə vasitələrinə aydınlıq gətirmək lazımdır.

Konseptlərin əksəriyyəti ilkin olaraq əşyavi-obrazlı, hissi zəmində yaranır: o, kollektiv fəaliyyət prosesində müəyyən predmet və ya hadisənin (məsələn, ağac, quş, ev, kənd və s.) empirik obrazı şəklində formalaşır. Bu ilkin obrazlar sonralar (konseptin ilkin «məzmunu» digər idrak fəaliyyəti nəticəsində əldə olunmuş biliklən hesabına tədricən mürəkkəbləşəndən sonra) insanın şüurunda həmin konseptin ən bariz nümunəsi funksiyasını yerinə yetirirlər. Konsept «müəyyən linqvokulturo-loji mühitdə mövcud olan insanların şüurunda formalaşır, «ad» alır. O «ad» səsləndirildikdə dil daşıyıcısının şüurunda onun daşıdığı konsept canlanır. Hər dilin daşıyıcıları müəyyən spesifik (təbii, ictimai, tarixi və s.) mühitdə formalaşdıqlarından onların şüurundakı konseptlər və bütövlükdə milli konseptosfer spesifik xüsusiyyətlərə malik olur…» (Ağayeva, 2019: 184).

Konseptlər bilavasitə insanın sensor təcrübəsi əsasında formalaşırlar: insan duyğu orqanları vasitəsilə gerçəkliyi qavrayır, bu gerçəklikdə öz yerini dərk edir və şüurunda artıq mövcud olan konseptlərlə onu tutuşdurur və onun digərləri arasında yerini müəyyənləşdirir və ya onları başqa insanlarla ünsiyyətin gedişində qavrayır və s. Zənnimizcə, bu sıranı uzatmaq mümkün olsa da, ən əsası birincisidir, çünki o, başqaları üçün fundament rolunu oynayır, konseptosferin formalaşması üçün sonradan yaranan konseptlər və ya konseptual mənalar məhz bu fundamentə söykənirlər, yəni bilavasitə hiss orqanları vasitəsilə duyulub, qavranılan, şüurda müəyyən obraz kimi mövcud olan konseptlər ilkin və ən vacibidir, onlar məna tutumunun genişlənməsi hesabına tədricən zənginləşir, mürəkkəbləşir, yeni çalarlar kəsb edir, abstraktlaşır, duyğu orqanları vasitəsilə duyulmayan mücərrəd hadisələrdə əks olunur. Bunun belə olduğunu mücərrəd konseptlərin anlaşılıb qavranılması məqsədilə onların mütləq misallar vasitəsilə izah olunmasından görmək olar ki, bu da konseptlərin əksəriyyətinin obrazlı təbiətli olmasına dəlalət edir. Məhz obrazlılıq hesabına kommunikasiya prosesində bu və ya digər məna aydın və anlaşıqlı çatdırıla bilir. Konseptlə bağlı əlamətlərin sayı, onun abstraktlaşması artdıqca, konsept hissi obrazlılıqla yanaşı bilavasitə düşünmə məhsuluna çevrilə bilir. Bu zaman nəzərə almaq lazımdır ki, istənilən halda onun əsasında hissi zəmin dayanır.

Konsept şüurda formalaşıb, orada saxlanıldığına görə duyğu orqanları vasitəsilə qavranılmaya gəlmir. O elə bir «şey»dir ki, biz onun mahiyyətini başa düşür, amma tam izah edə bilmirik. Onun

fənlərarası səciyyəli olması da onun vahid tərifinin verilməsində çətinlik yaradır, çünki bu baxımdan hər elmin öz əsas bildiyi mahiyyətlər var və tərifin verilməsində onlar əsas götürülür. Konseptlə fəlsəfə, məntiq, psixologiya, kulturologiya, linqvistika kimim elm sahələri məşğul olur. Konsept insanın mental prosesləri ilə bağlı olduğundan dilçilikdə məhz koqnitiv linqvistikada o, əsas terminlərdən biridir. Amma konseptlə məşğul olan, onu öyrənən dilçilik elmi yalnız koqnitiv linqvistika deyil. Linqvokulturologiyanın tədqiqatçıları da konseptlərə ciddi diqqət yetirirlər.

Adından göründüyü kimi, linqvokulturologiya iki elmin –linqvistika və kulturologiyanın qovuşuğunda yaranan elm sahəsidir. Buna görə də bu istiqamət çərçivəsində bütün dil hadisələri dil daşıyıcısının mədəniyyəti prizmasından nəzərdən keçirilir. Linqvokulturologiyada müəyyən mədəniyyətin konsepti həmin mədəniyyətin mentallıq vahidi kimi götürülür: mentallıq isə «doğma dilin kateqoriya və formalarında dünyagörüşü kimi başa düşülür və bu da özündə, milli xarakterin tipik təzahürlərində intellektual, mənəvi və iradə keyfiyyətlərini birləşdirir» (Maslova, 2001: 49). V.A.Maslova A.Y.Qureviçə istinadən bildirir ki, mentallıq «dünyanı görmə üsuludur, o, düşünülmüş fikir sistemləri ilə işləyən ideologiya ilə identik deyil, əsasən isə xeyli dərəcədə düşünülməmiş və məntiqi aşkarlanmamışdır. Mentallıq fəlsəfi, elmi və ya estetik sistemlər deyil, ictimai şüurun elə səviyyəsidir ki, bu səviyyədə fikir emosiyalardan, latent vərdişlərdən və şüur priyomlarından ayrılmır. Beləliklə, mentallıq insanların mənəvi birləşməsi üçün görünməz minimumdur ki, onsuz istənilən cəmiyyətin təşkili mümkün deyil. Xalqın mentaliteti dilin ən vacib mədəni konseptlərində aktuallaşır» (Maslova, 2001: 49).

Konsept adətən bir deyil, daha çox leksik vahidlə əlaqələndirilir, yəni konsepti realizə etmək üçün kontekstdən, situasiyadan asılı olaraq fərqli dil (daha çox leksik) və bir sıra hallarda qeyri-dil vahidlərindən istifadə olunur.

Tədqiqatçılar konseptin strukturunun çoxkomponentli olmasını qeyd edir və onun tərkibində, məsələn, bir-birində yaranma vaxtına, və semantikasına görə fərqlənən tarixi layları fərqləndirirlər. *Onlar müxtəlif dövrlərin mədəni həyatının nəticəsi və ya «çöküntüsüdür»: hərfi məna (daxili forma), passiv (tarixi), ən yeni (aktual və aktiv*) (Stepanov, 1997: 41). Bu layların hər birində obraz, dəyər və anlayış komponenti ola bilir. Obraz tərəfinə «predmet, hadisələrin yaddaşımızda əks olunmuş və görmə, eşitmə, taktil, dad, iy bilmə vasitəsilə qəbul olunan xarakteristikaları»; anlayış tərəfinə «konseptin dildə fiksəsi, onun bildirilməsi, təsviri, əlamət strukturu, definisiyası, bu konseptin bu və ya digər konseptlərlə müqayisəli xarakteristikası (çünki konsept heç vaxt təcrid olunmuş şəkildə mövcud olmur)»; dəyər tərəfinə isə bu psixi törəmənin həm fərd, həm də kollektiv üçün vacibliyi aiddir. *Mədəniyyətin daşıyıcılarının hər birinə məlum və vacib olan əsas aktual əlamətdən ibarət olan aktiv qat ümummilli konseptə daxildir. Passiv qatlar (mədəniyyət daşıyıcılarının müəyyən qrupları üçün aktual əlavə əlamətlər) ayrı-ayrı submədəniyyətlərin konseptosferlərinə mənsubdur* (Karasik, Slyshkin, 2001: 78). Bu siyahıya ekspressiv-gmosional komponenti də əlavə etmək olar, çünki insanın fikri çox vaxt hisslərlə əlaqədar olur. Konseptin fərdi təbiətini də xüsusilə qeyd etmək lazımdır, çünki o, subyektiv fəaliyyətin gedişində fərdi şüurda təşəkkül tapır və sonra «yayılmağa» başlayaraq ümumun (müəyyən sosial qrupun və ya etnosun) konseptinə çevrilir. Bu proses ani olmur, fərdi şüurda konseptin formalaşmağa başladığı vaxtla geniş yayılmasına qədər müəyyən zaman kəsiyi keçir.

Obrazlı komponent konseptin psixofizioloji əsasıdır. Popovanın fikrincə (Popova, Sternin, 2010: 15), obrazlı komponentə perseptiv və koqnitiv obrazlar daxildir. Onlar konseptləşən predmet və ya hadisənin xarakteristikalarını eyni dərəcədə əks etdirirlər. Koqnitiv (metaforik) obrazın struktur elementi kimi konseptin nüvəsinə daxil olması vacib deyil, halbuki fərdi şüurda konkret obraz konsepti məhz bu dil daşıyıcısı üçün kodlaşdırır.

Konseptə dair tədqiqatlarda onun strukturu sxematik şəkildə «nüvə» (baza obrazı) və «civar» (əlavə koqnitiv əlamətlər) hissələrindən ibarət «qurum» kimi verilir. Linqvokulturologiya üçün məhz konseptin nüvəsi ən böyük dəyər kəsb edir, çünki «konseptlər nəsə «güclü» (yəni dəyər baxımından vurğulanmış) şüur nöqtəsi ətrafında cəmlənirlər ki, ondan da assosiativ vektorlar uzanır. Buna görə də konseptin nüvəsi dil daşıyıcıları üçün ən aktual assosiasiyalar, civarı (periferiyanı) isə daha az aktual assosiasiyalardan ibarət olur. Əlbəttə dil daşıyıcısı konsepti konkret

nitq məqamında dil vahidləri vasitəsilə səsləndirəndə bu barədə düşünmür. Konsept yerindən asılı olaraq əsas nüvə elementi və ya nüvədən çox uzaq əlamətlə verilə bilir və bu zaman dil daşıyıcısı fikrini daha dolğun çatdırmaq və adresat tərəfindən dəqiq başa düşülmə barədə düşünür.

«Nüvə-civar» cütlüyü linqvokulturoloji konseptin strukturunu sxematik ifadə edir. Əslində isə onun strukturu mahiyyət etibarilə xeyli geniş və dərindir. Konseptin strukturunun çoxlaylılığı heç kimdə etiraz doğurmur, lakin bununla belə onun təsvirinə bir neçə yanaşma fərqləndirmək olar və bu yanaşmalar tərkib elementlərinin miqdarı və xarakteri ilə fərqlənirlər.

Dil və təfəkkür arasında əlaqənin olması hazırda danılmaz faktdır. «*Yalnız şüurda gedən idrak prosesləri dilə təsir etmir, həm də dil idrak proseslərinin formalaşmasında iştirak edir»* (Ağayeva, 2019: 120). Aydındır ki, konsept dildə ifadə olmalıdır. Amma elə konsertlər də var ki, onlar dildə öz əksini tapmayıb. Əgər konsept dil reprezentasiyası almağa «layiqdirsə», dildə onu əks etdirmək üçün çoxlu üsullar var. Bunu leksemlər, frazeologizmlər, söz birləşmələri, cümlələr vasitəsilə etmək mümkündür. Amma linqvokulturologiya hüdudlarında konsepti ayrıca götürülmüş sözlə eyniləşdirmək mümkün deyil, çünki konsept sözün özü üçün deyil, onun hər lüğəti mənası üçün mövcuddur. Konsept sözün mənasından deyil, bu lüğəti definisiyanın insanın şəxsi və onun millətinin tarixi təcrübəsi ilə toqquşması nəticəsində yaranır. Olur ki, konsept eyni bir dilin daxilində bir sıra leksik vahidlərlə verballaşa bilir və əksinə, eyni bir işarəyə bir neçə konsept müvafiq olur. Bunu müxtəlif dilləri qarşılaşdırdıqda daha bariz görmək olar, çünki *«müxtəlif dilləri bir-birindən fərqləndirən yalnız leksik vasitələr və qrammatik qaydalar deyil, onlardan istifadə edən dil daşıyıcısı üçün hər sözün arxasında açılan «aləm»dir. Buna görədir ki, ən qədim və ümumbəşari predmet və hadisələri bildirən sözlərin arxasında müxtəlif dil daşıyıcıları üçün fərqli mənalar (müxtəlif səviyyələrdə və dərəcədə) açılır»* (Əhmədova, 2015: 210).

Nəzərə almaq lazımdır ki, konsept həm dil, həm də təfəkkürdür, buna görə də dil vasitələri konseptin mənasının yalnız bir hissəsini çatdırırlar. Bunu çoxsaylı sinonimlərin olmasından, eyni bir konseptin ən müxtəlif izahlarının mövcudluğundan görə bilərik. «*Sözün mənası ifadə olunan konseptin məzmunu haqqında ümumi təsəvvür yaratmaq, həmin sözlə onun ayrı-ayrı xarakteristikalarının təqdimatının məlum hüdudlarını cızmaq cəhdidir»* (Boldyrev, 2001b: 25).

Bundan başqa, mədəni konsept dildə yalnız leksik və frazeoloji vasitələrlə deyil, həm də presedentli mətnlər, etiket formulları və nitq-davranış taktikaları, sosial həyatın təkrarlanan fraqmentləri vasitəsilə də realizə olunur (Vereshchagin, Kostomarov, 1999: 12). Hər hansı konseptin çatdırılması üçün bütöv mətnlərdən istifadə etmək lazım olan hallarda onun mürəkkəb və çoxcəhətli olmasından danışmaq olar, çünki bu halda bütöv situasiyaların dərk olunmasından, nəzərdən keçirilməsindən söhbət gedir.

Beləliklə, konsept nüvə və civardan (periferiya) ibarət olan mürəkkəb strukturdur. Konseptin nüvəsinə onun məna tutumunu maksimum dolğunluqla əks etdirən əlamət və xüsusiyyətlər daxildir. Onları adətən subkonsept və ya mikrokonsept adlandırırlar (Əhmədova, 2016: 173). Civara isə konseptin nüvəsi ilə daha az bağlı olan və onun mənasının müəyyən cəhəti və çalarını əks etdirən elementlər daxildir ki, bunları da mərkəzdən (nüvədən) uzaqlaşma və onunla əlaqələrin azalma dərəcəsinə görə aspekt, seqment, əlamət adlandırırlar. Ü.Əhmədovanın qeyd etdiyi kimi, «*Mikrokonseptlər öz növbəsində aspektlərə, onlar isə seqmentlərə bölünür və eyni bir seqment müxtəlif mikrokonseptlərə aid ola bilir»* (Əhmədova, 2016: 16)

Dildə konsept dil vasitələrinin köməkliyi ilə verballaşır, amma konsept sadəcə sözdən böyükdür: onda müəyyən mədəniyyətin nümayəndəsi üçün anlaşıqlı olan dərin məna durur. Özü də bu məna (mənalar) tədricən formalaşır, zənginləşir, milli konseptosferə daxil olandan sonra başqa fərdlərin bu konseptosferə töhfə verdiyi məna çalarlarını da mənimsəyir. Bu isə konseptin tədricən formalaşıb, mürəkkəbləşməsinə dəlalət edir və onun dünyanın şüurda formalaşmış mənzərəsindən dünyanın dildə əksini tapan mənzərəsinə keçiddə necə və hansı vasitələrlə realizə olunmasını ön plana çəkir, diqqət mərkəzinə gətirir və məhz bu realizə vasitələri müəyyən dolğunluqla konseptin dil vasitələrinin köməkliyi ilə strukturunu qurmağa, onun struktur elementlərinin bir-biri ilə əlaqələrini «əyani» öyrənməyə imkan verir.

Konsept mental vahiddir və bu mental vahidin çoxlu dil reprezentasiyası olur. Konseptin mədəni «damğalı» mənası ifadə olunma baxımından bir çox dil vahidləri ilə təmsil olunur. Bu, əsasən leksik, frazeoloji, sintaksik vahidlərdir. Lakin reprezentasiya vahidləri bunlarla məhdudlaşmır. Konsept müəyyən jestlər, hərəkətlər, şərti işarələr və hətta bütöv mətnlər vasitəsilə də ifadə (reprezentasiya) olunə bilir. Bu isə onu göstərir ki, konsept özü-özlüyündə konkret ifadə vasitəsinə bağlı deyil. Bu bağlılıq milli şüur, etnosun konseptosferi səviyyəsində mövcud olmasa, onun çatdırılması və «necə var» dərki mümkün olmazdı. Bu baxımdan konseptin çatdırılması, reprezentasiyasında paremiyalar – atalar sözləri və məsəllərin xüsusi yeri var. Tamamilə haqlı olaraq qeyd olunur ki, atalar sözləri milli təfəkkürdəki cilalanmış tarixi təcrübəni, dərin və sanballı həyat həqiqətlərini bədii idrak və təxəyyülün süzgəcindən keçirərək yaşadır, onları tükənməz bir enerjiylə dolğun əks etdirir (Bəydili, 2004: 4).

Atalar sözləri dildə uzun əsrlər boyu tədricən formalaşıb, özlərində milli özəlliklar daşıdıqlarından, onlar həm xalqın dünyagörüşünü, bu və ya digər «hadisəyə» münasibətini və bu münasibətin necə dəyişdiyini görməyə imkan verirlər, çünki etnosun (xalqın) yaddaşı, tarixi, onun idrak fəaliyyətində əldə etdiyi, topladığı təcrübə konseptlər şəklində onlarda realizə olunub və toplum şəkildə saxlanılır.

Atalar sözlərində əks olunmuş bilik konkret etnomədəni birliyin üzvü olan insanların gündəlik təcrübəsinə söykənir. D.Kristal hesab edir ki, «*proverbs convey the piece of traditional wisdom, handed down by previous generations. The effectiveness of a proverb lies largely in its brevity and directness. The syntax is simple, the images vivid, and the allusions domestic, and thus easy to understand. Memorability is added through the use of alliteration, rhythm and rhyme*» (Atalar sözləri xalqın nəsildən-nəsilə ötürülən müdrikliyinin bir hissəciyini çatdırır. Atalar sözlərinin dinləyiciyə effektiv təsiri onların qısa və aydın olması ilə bağlıdır. Sintaksisinin sadəliyinə, parlaq obrazlılığına və həmin mədəniyyət üçün əsli olan allüziyalara görə onlar asanlıqla başa düşülür və alliterasiyalar, ritm və qafiyyələrə görə asan yadda qalırlar) (Crystal, 2005: 184).

C.Rocers hesab edir ki, atalar sözlərindən geniş istifadə aşağıdakı faktla şərtlənir: «*Since proverbs represent the distilled wisdom from decades and centuries of human experience, it is small wonder that many of them become fixtures of the language*» (Atalar sözləri onilliklər və əsrlər ərzində süzgəcdən keçirilmiş insan təcrübəsi müdrikliyi olduqlarına görə onların çoxunun dilin ayrılmaz hissəsinə çevrilməsi təəccüblü deyil) (Rogers, 1991: 1). Bu isə o deməkdir ki, atalar sözləri xalqın mədəniyyəti və mentaliteti haqqında çox dəyərli informasiya mənbəyidir, çünki onlar xalqın dil şüurunun məhsulu olub, nəsillərin və onların ayrı-ayrı nümayəndələrinin maddiləşmiş təcrübəsini ifadə edirlər.

Özündə xalqın müdrikliyini daşıyan, universal nəticələr qismində istifadə olunan atalar sözləri yazılmamış qanun qismində istənilən adama tətbiq oluna bilir və buna görə də «qəhrəmanlıq» linqvomədəni konseptinin milli-spesifik xüsusiyyətlərinin müəyyənləşdirilməsində məhsuldar istifadə oluna bilər.

İngilisdilli mədəniyyətdə «heroism» bütövlükdə müstəsna igidlik («Heroism: veiy great courage» - Qəhrəmanlıq – müstəsna igidlikdir) kimi qavranılır. Atalar sözlərinə görə, insan şərait tələb etdikdə qoçaqlıq, igidlik göstərir: «*A good cause makes a stout heart and a strong arm*» (Əlverişli şərait ürəyi cəsur, qolları isə güclü edir); yaxud təhlükəli vəziyyətdə olduğunu bilməyəndə: «*Nothing is so bold as a blind mare*» (Kor yabıdan cəsarətlisi yoxdur).

Atalar sözlərindən görünür ki, qəhrəmanlaq davranışına misalları ən qədim dövrlərdə də tapmaq olar: «*Brave men lived before Agamemnon*» (Aqamemnon dövründə də qəhrəmanlar vardı). Cəsur adamların adi adamlardan fərqi onların adilərdən keyfiyyətlərinə görə üstün olmasındadır: «*One, but that one is a lion*» (Tək də olsa, şir kimi güclüdür); «*One man is worth a hundred and a hundred is not worth one*» (Bir adam yüz adama dəyər, yüz adam isə birinə də dəyməz).

Hər hansı bir adamın cəsur, qoçaq olduğunu bildirmək üçün onu güclü heyvana bənzədirlər: «*Bold as lion*» (Şir kimi cəsurdur); «*Fight like a lion*» (Şir kimi vuruşmaq); «*Like, a lion in the field*» (Döyüş meydanında şir kimi vuruşur). Bir sıra hallarda onu möhkəm metalla («*Bold as brass*» – mis kimi möhkəm); möhtəşəm ağacla («*Heart of oak*» – Ürəyi palıddan) və ya hünərləri yaxşı məlum olan adamla («*Bold as Hector*»- Hektor kimi cəsur) müqayisə edirlər.

Qoçaq, cəsur olmaq üçün vacib olan keyfiyyətlər yalnız zahiri görünüşlə bağlı deyil: «*Gilt spurs will not take a knight*» (İnsanı cəngavər edən qızılı mahmızlar deyil). Burada başqa keyfiyyətlər vacibdir. Məhz onların məcmusu cəsur davranışı şərtləndirir. Bunlardan aşağıdakıları göstərmək olar:

- öz gücünə inanmaq. Bu təhlükənin öhdəsindən gəlməyə rəvac verir: «*A man of courage never wants weapon*» (Qorxmaz adama silah lazım deyil); «*A strong man never wanted a weapon*» (Güclü adamın heç vaxt silaha ehtiyacı olmayıb);
- naməlumluğun qarşısında qorxunun olmaması: «*Ne was a bold man that first ate an oyster*» (Qoçaq istridyanın (dəniz ilbizinin) birinci dadına baxandır);
- güclü iradə, inadkarlıq, mətanət. Atalar sözlərinə görə, güclü iradəsi olan istədiyinə nail ola bilər: «*Nothing is impossible to a willing heart, Where there is a will, there is a way*» (Həvəs olsa, imkan həmişə tapılar); «*When your will is ready, your feet are light*» (Özün hərəkətə hazır olanda ayaqlar özləri gedir); «*A wilful man will (must) have his way*» (İradəli adam öz yolu ilə gedir); «*Wit and will strive for the victory*» (Ağıl və iradə qələbəyə can atırlar).
- qəti qərar qəbul etmək qabiliyyəti: «*If you gently touch a nettle, it'll sting you for your pains; grasp it like a lad of mettle, an' as soft as silk remains*» (Gicitkanı yavaş-yavaş, üslubca tutsan, yandıracaq, kəskin yapışsan - yandırmaz);
- düşmənə güzəştə getməmək və ya onunla danışıqlar aparmamaq: «*Valour that parleys is near yielding, Virtue which parleys is near surrender*» (Danışıqlara gedən şücaət güzəştə getməyə, danışıqlar aparan fəzilət təslim olmağa yaxındır);
- sayıqlıq, məqsədə aparan yolda yarana biləcək çətinliklərə və maneələrə hazır olmaq: «*Ne must have iron nails that scratches a bear*» (Ayını qaşıyanın dəmir dırnaqları olmalıdır, yəni təhlükəli işə girişən yaxşı yaraqlanmalıdır); «*Courage ought to have eyes as well as arms*» (Cəsur adam diqqətli və güclü olmalıdır);
- yığcamlılıq, diqqətlilik, qəfil baş verənlərə hazır olmaq, gözlənilməz məqamlarda özünü itirməmək, çünki özünü itirmək məğlubiyyətə aparır: «*Ne who hesitates is lost*» (Tərəddüd edən uduzur); «*A man surprised is half beaten*» (Qəfildən yaxalanan yarımməğlubdur);
- düşmənin sayıqlığını kütləşdirməyə kömək edən zirəklik, fərasət və biclik: «*Ft is a bold (or wily) mouse that breeds (or nestles) in the cat's ear*» (Fərasətli siçan pişiyin qulağında balalayır - yuva düzəldir mənasında).

Nəzərdən keçirdiyimiz misallar göstərir ki, ingilisdilli mədəniyyətdə qəhrəmanlıq qəhrəmanın davranışında, hərəkətlərində özünü göstərir ki, bu da öz növbəsində aşağıdakı keyfiyyətlərin məcmusundan əmələ gəlir: *bravery* (cəsarət), *boldness* (qoçaqlıq), *valour* (hünər), *will* (iradənin gücü), *uncompromisingness* (güzəştə getməmək), *self-assurance* (özünə inam), *quick wit* (zirəklik), *fortitude* (dözümlülük), *fearfidness* (qorxmazlıq) və *watchfulness* (sayıqlıq). Bundan başqa, deyə bilərik ki, dünyanın ilkin konseptləşdirilməsinin əksi vasitəsi olan bu keyfiyyətləri aktuallaşdıran atalar sözləri həmin keyfiyyətlərin konseptosferdə qarşılıqlı əlaqəsinin göstəricisidir. Buna görə də, Y.N.Karaulovun terminologiyasından çıxış edərək, söyləmək olar ki, ingilis «heroism» konsepti (Karaulov, 1976: 211) «*bravery*», «*boldness*» və «*valour*» konseptləri ilə xüsusi əlaqədə, onlar isə, öz növbəsində, öz aralarında eynilik münasibətində (Q.V.Tokarevin terminologiyasına görə (Tokarev, 2004: 16) olur, «*wiir*», «*uncompromisingness*», «*self-assurance*», «*quick wit*», «*fortitude*», «*fearlessness*» i «*watchfulness*» konseptləri ilə isə ekvipolent münasibətlərə girirlər (Karaulov, 1976: 211).

Hünərin göstərilməsinə gəldikdə isə, qeyd etmək lazımdır ki, bu, insanın həyatında öz izlərini qoyur. Birincisi, cəsurlar uğur qazanır, yəni uğur cəsurları sevir: «*Fortune favours the brave*» (Tale cəsurlara yar olur); ikincisi, cəsur öz hünərinə və cəsarətinə görə mükafat alır: «*None but the brave deserve the fair*» (Yalnız cəsurlar gözəllərə layiqdir); «*Faint heart never won fair lady*» (Qorxaq ürək gözəl xanıma çata bilməz); «*He that comes first to the hill may sit where he wills*» (Təpəyə birinci qalxan istədiyi yerdə otura bilər). Beləliklə, demək olar ki, «*heroism*» konsepti «*success*» konsepti ilə ekvipolent münasibətdə olur. İngilis mədəniyyətində «*success*» sözü altında insanın can atdığına çatdığı vəziyyət başa düşülür (*Success: the fact that you have achieved smth. That you want and have been trying to do or get*).

«Success» konseptini aktuallaşdıran atalar sözlərinə «glory» (şöhrət) konseptini (*Glory: praise, honour or admiration which is given to sbd. because they have achieved smth. important* (Longman Dictionary of English Language and Culture, 2002)) və onun «heroism» konsepti ilə ekvipolent münasibətlərini obyektivləşdirən atalar sözlərini də aid etmək olar. Atalar sözlərinə görə, qoçaq, cəsur adamlar təvazökar olur və şöhrətə, şərəfə can atmırlar: «*Brave actions never want a trumpet*» (cəsur hərəkətlərin alqışa ehtiyacı yoxdur); «*A good name keeps its lustre in the dark*» (Yaxşı ad öz parıltısını göstərmir). Şöhrətə can atan isə əsasən buna layiq olmur: «*Ne that desires honour is not worthy of honour*» (Şöhrət istəyən ona layiq deyil). Məşhurluq dərəcəsi dəf edilən təhlükə və göstərilən güclə ölçülür: «*The more cost, the more honour; The more danger, the more honour*» (Təhlükə nə qədər böyük olsa, şöhrət də bir o qədər çox olar).

## Nəticə

Beləliklə, linqvomədəni konseptin məzmununda milli-spesifik komponent atalar sözlərində bariz görünür, çünki məhz onlarda kollektiv təcrübə ümumi davranış norması kimi öz əksini tapır. Bu baxımdan dilin paremioloji fondu xalqın mədəniyyəti, onun xüsusiyyətləri, davranışı haqqında dəyərli informasiya mənbəyidir.

«Qəhrəmanlıq» mövzusunda olan ingilis atalar sözlərinin öyrənilməsi ingilislərin qəhrəmanlıq davranışı haqqında təsəvvürlərini əks etdirir, həmin konseptin ingilis konseptosferində başqa konseptlərlə qarşılıqlı əlaqələrini aşkarlamağa imkan verir. Atalar sözlərindən görünür ki, insan qəhrəmanlıq keyfiyyətlərini daha çox müharibə vaxtı, döyüş meydanında, yəni təhlükə ilə üzləşdikdə təzahür etdirir.

## Ədəbiyyat

1. Ağayeva, S. (2019). Dillərarası ünsiyyətdə konsept və dil vahidlərinin müvafiqlik problemi. Filologiya məsələləri. № 2, s.184-189.
2. Maslova, V.A. (2001). Lingvokulturologiya: Ucheb. posobiye dlya stud. vyssh. ucheb, zavedeniy. M.: Izdatel'skiy tsentr «Akademiya».
3. Stepanov, YU.S. (1997). Konstanty: Slovar' russkoy kul'tury. Opyt issledovaniya. M.: Shkola «YAzyki russkoy kul'tury».
4. Karasik, V.I., Slyshkin, G.G. (2001). Lingvokul'turnyy kontsept kak yedinitsa issledovaniya. Metodologicheskiye problemy kognitivnoy lingvistiki: nauch. izd. pod. red. I.A.Sternina. Voronezh: Izd-vo VGU, s.75-79.
5. Popova, Z.D., Sternin, I.A. (2010). Kognitivnaya lingvistika. M.: ACT: Vostok – Zapad.
6. Ağayeva, S. (2019). Dünyanın dil mənzərəsi. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunmuş Azərbaycan filologiyasının aktual problemləri mövzusunda Respublika elmi-nəzəri konfransının materialları. Bakı, 15 may, s.120-121.
7. Əhmədova, Ü. (2015). İngilis frazeologizmləri və atalar sözlərində «qadın» konsepti. Pedaqoji Universitet Xəbərləri. Humanitar elmlər bölməsi. Bakı, № 2, s.210-213.
8. Boldyrev, N.N. (2001b). Kontsept i znacheniye slova. Metodologicheskiye problemy kognitivnoy lingvistiki pod red. I.A.Sternina. Voronezh: VorGU, s.25-35.
9. Vereshchagin, Ye.M., Kostomarov, V.G. (1999). V poiskakh novykh putey razvitiya lingvostranovedeniya: kontseptsiya rechepovedencheskikh taktik. M.: In-t rus.yaz. im. A.S. Pushkina.
10. Əhmədova, Ü. (2016). «Qadının zahiri xüsusiyyətləri» mikrokonsepti. Tağıyev oxuları. Elmi məqalələr məcmuəsi. Bakı: BSU, №1, 173 s.
11. Əhmədova, Ü. (2016). Azərbaycan frazeologizmləri və atalar sözlərində «qadın» konsepti. Dil və ədəbiyyat. № 2(98). Bakı, s.16-18.
12. Bəydili, C. (2004). Bütün sözlərdən ulu sözlər. Atalar sözü. Bakı: Öndər nəşriyyatı, s.4-14.
13. Crystal, D. (2005). The Cambridge Encyclopedia of the English Language. Cambridge: Cambridge University Press.
14. Rogers, J. (1991). The Dictionary of Cliches. New York: Ballantine Books.

15. Karaulov, YU.N. (1976). Obshchaya i russkaya ideografiya. M.: Nauka.
16. Tokarev, G.V. (2004). Diskursivnyye liki kontsepta: monografiya. Tula.
17. Longman Dictionary of English Language and Culture. (2002). Harlow: Longman.

Göndərilib: 14.11.2023 Qəbul edilib: 02.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/42-47

**Brilyant Cəfərli**
AMEA Naxçıvan Bölməsi
İncəsənət, Dil və Ədəbiyyat İnstitutu
dissertant
brilliant1cefer@hotmail.com

# AZƏRBAYCAN MEMARLIĞININ DÜHASI ƏCƏMİ NAXÇIVANİ YARADICILIĞINDA ORNAMENTASİYA ZƏNGİNLİYİ

## Xülasə

Məqalə Naxçıvan memarlıq məktəbinin banisi, Azərbaycan memarlığının dühası Əcəmi Əbubəkr oğlu Naxçıvaninin inşa etdiyi memarlıq abidələri üzərində həkk olunan ornamentlərdən bəhs etmişdir. Göstərilir ki, dahi memarın əsərlərində ornamentasiya zənginliyi ən üst səviyyədə tətbiq olunmuşdur. Bu əzəmətli tikililərin səthləri üzərində həm həndəsi, həm də nəbati naxışlar istifadə olunmuşdur. İstifadə edilən ornamentlər ahəngdar şəkildə birləşərək bu abidələrin koloritini daha da artırmışdır. Əcəmi Naxçıvani əsərlərinə gözəllik bəxş edən ornamentlərin memarlıq formaları ilə birləşməsindən möhtəşəm abidələr yaranmışdır. Naxçıvanda ucaldılan memarlıq abidələrində memarlıqla ornamentasiyanın kontaminasiyası memarın dərin təfəkkürünün məhsuludur. Bu abidələr üzərində qədim Şərq və Qərb memarlığının sintezi özünü bariz şəkildə göstərir.

***Açar sözlər:*** *memarlıq, ornament, abidə, türbə, həndəsi, nəbati*

**Brilliant Jafarli**
ANAS Nakhchivan Department
Institute of Arts, Language and Literature
PhD student
brilliant1cefer@hotmail.com

## The richness of ornamentation in the creativity of the genius of Azerbaijani architecture Ajami Nakhchivani

## Abstract

The article dealt with the ornaments engraved on the architectural monuments built by Ajami Abubakr oglu Nakhchivani, the founder of the Nakhchivan School of architecture, the genius of Azerbaijani architecture. It was shown that the richness of ornamentation was applied in the works of the Great Architect at the highest level. Both geometric and botanical patterns were used on the surfaces of these majestic structures. The ornaments used harmoniously combined and increased the color of these monuments. Magnificent monuments were created from the combination of ornaments and architectural forms that gave beauty to the works of Ajami Nakhchivani. The contamination of architecture and ornamentation in the architectural monuments erected in Nakhchivan is a product of the deep thinking of the architect. The synthesis of ancient Eastern and Western architecture is clearly manifested on these monuments.

***Keywords:*** *architecture, ornament, monument, tomb, geometric, botanical*

## Giriş

Şərqin əfsanəsi sayılan Naxçıvan əsrlər boyu dahi şəxsiyyətlər yetirmişdir. Hər bir sahədə olduğu kimi memarlıq sahəsində də geniş təfəkkürü, dərin dünyagörüşü ilə seçilən memarlar böyük əsərlər yaratmış və gələcək nəsillərə memarlıq irsimizi yadigar qoymuşlar. Dünyanın naxışı, kainatın ornamenti adlandırılan Naxçıvanın adından da göründüyü kimi bu qədim diyar üzərində dərin mənaları ifadə edən ornamentlərlə zəngin memarlıq abidələrinin mövcudluğu ilə seçilir. Bu

abidələr dünyaya səs salmış Azərbaycan memarlıq tarixinin qədimliyini sübut edən daş salnaməmizdir. Bu mühüm meyarları nəzərə alaraq Azərbaycan memarlığının intibah (oyanış) dövrünün dahi memarı Əcəmi Əbubəkr oğlu Naxçıvaninin yaradıcılığını xüsusi qeyd etmək lazımdır. Naxçıvan memarlıq məktəbinin banisi, Azərbaycan memarlığının dühası, XII əsrdə yaşamış Əcəmi Əbubəkr oğlu Naxçıvani zəmanəsinə görə öz dərin təfəkkürü ilə mənimsədiyi bir çox elmləri birləşdirərək möhtəşəm əsərlər yaratmış və Azərbaycan memarlığına böyük töhfə vermişdir. Əcəmi Naxçıvaninin hələ uşaq yaşlarından üzə çıxan fitri istedadı və memarlıq elminə olan marağı onu cavan yaşlarında memarlıq təhsili almağa sövq etmişdir. Memarı dahi edən də elə onun riyaziyyat, cəbr, həndəsə, astronomiya, təsviri-incəsənət, fizika, kimya, estetika, təbiət, stilistika, mifologiya kimi bir çox elmlərə yiyənlənməsi və öyrəndiyi elmlərin dərinliyinə getməsi olmuşdur. Ensiklopedik biliyə malik Əcəmi Naxçıvaninin yaradıcılığında bu elm sahələri bütöv bir şəkildə təzahür etmiş və bu da orta əsrdə şərq renessansında (intibahında) Azərbaycan memarlığın oyanışı, yüksəlişi, çiçəklənməsi ilə nəticələnmişdir. XII əsr Azərbaycan memarlığının yüksəlməsi dövrü kimi tanınır. Azərbaycan Atabəylər dövlətinin qüdrətli hökmdarı, ulu atabəy Şəmsəddin Eldənizin hakimiyyəti dövründən başlayaraq Naxçıvanda məqbərələr, saraylar, məscidlər, müdafiə tikililəri inşa edilməyə başladı. Öz imzasını qoyduğu möhtəşəm əsərlərlə yalnız Şərqdə deyil, Qərb dünyasında da tanınan Əcəmi Naxçıvani Azərbaycan Atabəylər dövlətinin ərazisi olan Naxçıvanda arxitektura sənətini ən yüksək səviyyədə inkişaf etdirmişdir (Bünyadov, 1984: 190). Əcəmi Naxçıvani qazandığı biliyi yaratdığı əsərlərdə böyük məharətlə tətbiq etmiş və əzəməti ilə dünyaya səs salan, gözəlliyi ilə gözləri qamaşdıran möhtəşəm memarlıq abidələri ucaltmışdır. Azərbaycan memarlığında bir çox ilklərə imza atan Əcəmi Naxçıvani memarlıq sahəsində özünün yeni üslubunu yaratmışdır. İnşa etdiyi memarlıq abidələrində ənənə və novatorluğun birgə kontaminasiyasını əks etdirməsi memarın özünəməxsus üslubunun bariz nümunəsidir. Əcəmi Naxçıvani antik dövr memarlığını mükəmməl şəkildə öyrənmiş və yaratdığı abidələr üzərində tətbiq etmişdir. O Misir, Mesopotamiya, Yunan, Roma memarlığından bəhrələndiyi memarlıq formalarını və ornamentləri öz əsərlərində istifadə etmişdir. Əcəmi Naxçıvani əsərlərində Şərq və Qərb memarlığının sintezini aydın şəkildə görmək mümkündür. Memarın yaratdığı əsərlər üzərində demək olar ki, bütün dünya elmləri kompleks halında özünü ehtiva edir. Əcəmi dühasının fikir dünyası çox zəngin olmuşdur. Əcəmi Naxçıvani yaratdığı memarlıq abidələrində tektonikliyin, yəni həmin abidələrin hansı üsulla qurulmasının, hansı üsulla hissə-hissə yığılmasının, deformasiyaya qarşı hansı tədbirlər görülməsinin həllini tapan dahi memar olmuşdur. Buna görə də o "şeyx-ül mühəndis", yəni mühəndislərin başçısı titulunu qazanmışdır.

Fikrimizcə, memarlıq abidələri üzərində görünən və ona gözəllik verən hər bir detal, element, forma onu bəzəyi, dekorudur. Bu abidələrin müəyyən hissələrini gözəlləşdirmək üçün istifadə edilən bəzəklər isə ornamentlər adlanır. Əcəmi Naxçıvani yaradıcılığında memarlıq abidələri üzərində işlənmiş ornamentlər böyük ustalıqla tətbiq edilmiş, memarın yaratdığı abidələrə xüsusi, əsrarəngiz gözəllik vermişdir. Onun yaratdığı əsərlər üzərindəki hər bir ornamentin qədim mifologiyamıza dayanan dərin simvolik mənası vardır. Əcəmi memarlıq abidələri üzərində ən qədim türk simvollarından istifadə etmişdir. Memar inşa etdiyi tikililəri zərif, bir o qədər də zəngin mifik naxışlarla bəzənmiş kiçik ölçülü bişmiş kərpiclərlə üzləmişdir. Böyük ustad ucaldılan hər bir memarlıq abidəsi üzərində həndəsi və nəbati (bitki) naxışları birləşdirərək ortaya nəfis bir mənzərə çıxarmışdır. Memarlıq ilə ornamentasiyanın vəhdətini daşıdığı bu abidələrdə Əcəmi Naxçıvanı biliyinin dərinliyi bütövlükdə görülməkdədir. Əcəmi Naxçıvani əsərlərində böyük səbr tələb edən mürəkkəb həndəsi ornamentlərdən yaranan şəbəkə sisteminin növü olan cəfəri şəbəkə sistemini dəqiq hesablamalarla tətbiq etmişdir (Salamzadə, 2009: 6). Cəfəri şəbəkələr müstəvi üzərində müxtəlif üsullarla deşiklər açılmaqla yaranırlar və memarlıq abidələri üzərində daşı oyma üsulu ilə tətbiq edilirlər. İstifadə olunan hər bir ornament növü öz incəliyi və dekorativliyi ilə seçilir (3).

Memarlığın böyük ustadı Əcəmi Əbubəkr oğlu Naxçıvaninin inşa etdiyi memarlıq abidələrindən yalnız ikisi dövrümüzə qədər gəlib çatmışdır. Bunlardan biri memarın ilk əsəri sayılan Yusif Küseyr oğlu (Şeyx Yusif ibn Qasirin, ibn Qüseyyir) türbəsidir. Hal-hazırda istifadə etdiyimiz təqvimlə, yəni miladi təqvimlə 1162-ci ildə (hicri təqvimlə 557-ci il) bişmiş kərpicdən inşa olunmuş türbə

Azərbaycan Atabəylər dövlətinin hakimiyyəti illərində Naxçıvan şəhərinin rəisi (rəhbəri) olmuş, şeyxlər başçısı Yusif Küseyr oğlunun qəbri üzərində inşa olunmuşdur. XII əsrdə belə bir türbənin tikintisi Azərbaycan memarlığında yeni bir mərhələdir. Kərpic hörgüsü tətbiq edilən türbə planda səkkizbucaqlı biçimdə görünür və iki hissədən ibarətdir: yeraltı sərdabə və yerüstü qüllə (gövdə). Yeraltı sərdabənin hündürlüyü 3 metr, yerüstü qüllənin hündürlüyü isə kürsülükdən başlayaraq 7,2 metrdir. Türbənin gövdə hissəsi səkkiz üzü olan piramidal şəkilli örtük konstruksiyasına malikdir. Yerüstü qüllənin səkkiz səthi də daxildən və xaricdən dayaz sivri tağçalar içərisinə salınmışdır. Eksteryerdə səthi üzlərdə düzbucaqlı şəklində tağçalar işlənmişdir. Xarici səthlərdə tağçaların içində daşı oyma üsulu ilə əmələ gələn cəfəri şəbəkə kompozisiyası öz əksini tapmışdır. Tətbiq olunan bu şəbəkələr həndəsi ornamentlərin birləşməsindən yaranan girih (düyün) naxışlarının ahəngdar şəkildə kontaminasiyasından əmələ gəlmişdir (Qənbərova, 2008: 24). Abidənin səthləri üzərində tətbiq edilmiş cəfəri şəbəkə sistemi ilə qurulmuş həndəsi naxışlarının quruluşu kvadrat, düzgün altıbucaqlı və onların birgə kontaminasiyasından yaranan mütənasiblik sisteminə əsaslanır. Əcəmi Naxçıvani abidə üzərində sadə həndəsi ornamentlər olan nöqtə və düz xətlərdən başlayaraq girih adlanan ən mürəkkəb ornament formalarına qədər bir çox həndəsi formalardan böyük bir məharətlə istifadə etmişdir. Yusif Küseyr oğlu türbəsinin səthlərindəki həndəsi fiqurlardan altıbucaqlılar və səkkizbucaqlılar aparıcı rol oynamışdır. Bu həndəsi ornamentlərin birləşməsindən altıguşəli ulduzlar, səkkizguşəli ulduzlar, romblar, beşbucaqlılar, üçbucaqlılar əmələ gəlmişdir (Əliyev, 2007: 109-139). Yaranan ulduzlar astral ornamentlər siyahısına daxildir. Və nəticədə abidənin səkkiz üzündə də həndəsi ornamentlər ahəngdar şəkildə birləşdirilmiş, şəbəkə sistemi böyük ustalıqla qurulmuşdur. Şəbəkə sistemi ilə qurulan ornamentlərin içərisi nəbati naxışlarla bəzədilmişdir. Bu ornamentlər daşı oyma üsulu ilə icra olunan relyefli (qabarıq) naxışlardır. Beləliklə abidənin səthləri üzərində ornamentlərin müxtəlif növlərinin kompozisiyası yaranmışdır. Əcəmi Naxçıvaninin dərin təfəkkürünün izlərini daşıyan türbənin hər səthi digərlərindən fərqlənir. İşlənən ornamentlər əvvəlcə kənarda kiçik kərpiclərdən quraşdırılmış, sonra isə gəc məhlulu ilə tavalar şəklində birləşdirilərək səthlərin üzərində möhkəmləndirilmişdir (Salamzadə, 1976: 15). Çatmatağ şəkilli giriş portalı (baştağı) Π formasında haşiyə ilə çərçivələnmişdir. Bu haşiyə svastika (çərxi fələk) elementindən qurulmuş kvadrat formalı meandr ornamentidir.

Yusif Küseyr oğlu türbəsinin səthləri üzərində işlənmiş epiqrafik ornamentlər kufi xətti ilə həkk olunmuşdur. Kufi xətti ərəb əlifbasının kvadrat formalı xətt növüdür. Bu epiqrafik ornamentlərdə türbənin kimin şərəfinə və neçənci ildə tikilməsi, "Quran"dan ayələr və surələr, abidənin kim tərəfindən tikilməsi (memarın adı) qeyd olunmuşdur. İstifadə olunmuş bu ornamentlər giriş portalının üzərində düzbucaqlı formasında olan filenkada epiqrafik yazı şəklində, abidənin yerüstü qüllə hissəsi ilə örtük konstruksiyası olan günbəz (qübbə) hissəsinin arasındakı (gövdə ilə örtük hissəsi arasındakı keçid) friz adlanan yuxarı hissədə epiqrafik yazı kimi və türbənin giriş qapısı olan üzündən başlayaraq saat əqrəbi istiqamətində 2-ci üzündəki (giriş qapısından sol tərəfdəki) sivri tağçanın içərisində yuxarı hissədə epiqrafik yazı şəklində verilmişdir. Yusif Küseyr oğlu türbəsində şirli kərpiclər işlənməsə də, ornamentlərin bir çox növünün müxtəlif ölçülü kərpiclərlə işlənməsi və kərpiclərin fərqli formada düzülüşü abidənin koloritini (rənglərin harmonik birləşməsini) artırır (Səfərli, 2019: 55-58).

Əcəmi Əbubəkr oğlu Naxçıvaninin zəmanəmizə qədər gəlib çatmış ikinci böyük əsəri Şərqdə ilk dəfə qadına ithafən inşa edilən Möminə Xatun məqbərəsidir. Azərbaycan Atabəylər dövlətinin başçısı Şəmsəddin Eldənizin həyat yoldaşı Möminə Xatun miladi təqvimlə 1175-ci ildə (hicri təqvimlə 571-ci il) vəfat etdikdən sonra Şəmsəddin Eldəniz onun qəbri üzərində məqbərə ucaldılmasını arzulamış, lakin xanımının ölümündən bir ay sonra atabəy də vəfat etmişdir. 1175-ci ildə inşası başlanan məqbərənin tamamlanma prosesi miladi təqvimlə 1186-cı ildə (hicri təqvimlə 582-ci il) Şəmsəddin Eldənizlə Möminə Xatunun oğlu Məhəmməd Cahan Pəhləvan tərəfindən yerinə yetirilmişdir. Şərqdə ilk dəfə Azərbaycan qadınının yüksək statusunu təsdiq edən məqbərənin plan-məkan quruluşu onluq prinsipi üzrə işlənmişdir. Memar Əcəmi Naxçıvani bişmiş kərpicdən inşa olunan məqbərənin dayanıqlılığını artırmaq üçün hörgüdə palçığın içərisinə lazımi tikinti materialları ilə yanaşı yumurta ağı da daxil etmişdir. Əcəmi Naxçıvaninin inşa etdiyi bu möhtəşəm

abidə əzəməti ilə yanaşı vizual görüntüsü ilə də diqqətləri öz üzərinə çəkir. Bunun səbəbi memar Əcəmi Naxçıvaninin məqbərə üzərində böyük məharət və dəqiqliklə işlədiyi relyefli ornamentlərin abidəyə qatdığı möhtəşəm görüntüdür. Memarlıq abidələrinin gözəllik simvolları olan bu ornamentlər məqbərə üzərində Möminə Xatun kimi bir qadının gözəlliyini, zərifliyini təcəssüm etdirir. Məqbərənin eksteryerinin bəzədilməsində adi və şirli (firuzeyi kaşılı) bişmiş kərpicdən istifadə olunmuşdur (Salamzadə, 1976: 23). Yarusu yeraltı sərdabə və yerüstü qüllədən ibarət məqbərənin səthləri üzərində Əcəmi Naxçıvani həm həndəsi, həm də nəbati ornamentlərin müxtəlif növlərinin istifadəsindən ortaya möhtəşəm bir əsər çıxarmışdır. Sərdabə hissənin interyerindəki divarların hörgü sistemində cinağı naxış növündən (yolka naxışından) istifadə edilmişdir. Yəni üzlük kərpiclər ardıcıl olaraq üfüqi və şaquli hörülmüşdür. Abidənin sərdabə hissəsinin mərkəzindəki qalın onüzlü dayağın üzərində həm cinağı ornament, həm həm bitkisəl (nəbati) ornamentlər həkk olunmuşdur. Dayağın üzləri yan tərəflərə sivri tağbəndlərlə birləşmiş, bu da dayağa göbələkvari görüntü vermişdir. Dayağın tinlərindən qarşı künclərə kərpic qabırğalar (nervürlər) verilmişdir. Bu çıxıntılar dayağın gözəlliyini və işlənmə effektini artırır. Nervürlər sərdabə hissədə ulduzvari karkas görüntüsü əmələ gətirmişdir. Qabırğaların karkaslarının araları saya naxışlı, yəni birrəngli kərpic hörgüsü ilə üzlənmişdir. Bu da dayağa tektonik gözəllik vermişdir. Dayağın üzərində nəbati ornamentlərdən dördləçəkli çiçəklər və spiralvari formada düzülmüş yarpaqlar gözə çarpır (Qiyasi, 2019: 158).

Planda xaricdən onbucaqlı formasında olan Möminə Xatun məqbərəsinin qülləsinin on üzü də iç-içə iki tağça içərisinə salınmışdır. Birinci tağça düzbucaqlı formada, onun içərisindəki ikinci tağça isə stalaktitlidir. Düzbucaqlı formasındakı tağçalarda həm cəfəri şəbəkə sistemi, həm də epiqrafik yazı işlənmişdir. Abidənin stalaktitli tağçaları içərisində cəfəri şəbəkə sistemi böyük dəqiqliklə tətbiq edilmişdir. Stalaktitlər müqarna (pətəyəbənzər) tağ formasından yaranmışdır. Onun içərisi svastika və çarpazşəkilli ornamentlərlə doldurulmuşdur. Stalaktitlərdə və tağçaların içərisində firuzeyi kaşıdan (mayolikadan) istifadə olunmuşdur. Bu stalaktitlər üzərində müxtəlif naxışlar həkk olunmuş incə sütuncuqlar üzərində dayanır. Səthlər üzərindəki sütuncuqların orta hissələrində və başlıq hissələrində (kapitellərində) rombşəkilli dördbucaqlı və iki üz-üzə dayanmış buta formalı relyefli xonçalar işlənmişdir. Səthlər üzərində memarlıq elementləri (memarlıq detalları) ilə birgə tətbiq olunan ornamentlərin müxtəlif növlərinin işləndiyi bu abidə Naxçıvanda memarlıqla ornamentasiyanın sintezinin ən gözəl nümunələrindəndir. Məqbərənin eksteryerindəki şəbəkəli tağçalarda kvadrat, düzgün altıbucaqlı və onların birgə kombinasiyalarından yaranan, mütənasiblik və qızıl bölgü mütənasiblik sisteminə əsaslanan girih həndəsi naxışları işlənmişdir (Əliyev, Mazanov, Əsədov, 2022: 16-24). Şəbəkə sisteminin yaranmasında üç, dörd, beş, altı, səkkiz, on, on bir, on iki, on üçbucaqlı həndəsi ornamentlərdən istifadə olunmuşdur. Düzbucaqlı, romb, kvadrat və kublar da daxil olmaqla bu çoxbucaqlılar birləşərək üç, dörd, beş, altı, yeddi, səkkiz, on, on bir, on iki, on üçguşəli ulduzları əmələ gətirmişdir (Əliyev, 2007: 109-152). Yaranmış bu ulduzlar da astral ornamentlər siyahısına daxildir. Şəbəkə sisteminin içərisində nəbati naxışlar və epiqrafik ornamentlər işlənmişdir. Əcəmi Naxçıvani abidənin on səthi (üzü) üzərində həndəsi naxışlarla birlikdə sarmaşıqların və spiralvari naxışların birləşməsindən əmələ gələn islimi (arabeska) adlı nəbati naxışların və epiqrafik yazılı ornamentlərin kontaminasiyasını yaradaraq abidənin ornamental zənginliyi artırmışdır (Qənbərova, 2008: 253). İslimi adlanan nəbati ornamentlərdə lalə və yarpaq motivlərinin təsvirləri üstünlük təşkil edir. Lalə çiçəyi saf, təmiz sevginin simvoludur. Abidənin üzərində bu bitki motivinin işlənməsi də Şəmsəddin Eldənizin xanımı Möminə Xatuna bəslədiyi saf, təmiz sevginin təcəssüm formasıdır. Lalə motivli ornamentlər məqbərənin səthlərində madoksil naxış növünü əmələ gətirmişdir. Abidənin bir səthinin üzərində bitki ornamentlərindən olan palmet motivli naxış da işlənmişdir. Digər bir səth üzərində isə kvadrat formalı meandr ornamenti düzbucaqlı tağçanı Π formasında haşiyələmişdir. Məqbərə üzərində su damcısı şəklində olan ornamentlərə də rast gəlinir (Qənbərova, 2007: 184).

Möminə Xatun məqbərəsi üzərində işlənən kufi xətli epiqrafik ornamentlər səthlər üzərində ayrı-ayrı hissələrdə müxtəlif formalarda tətbiq edilmişdir. Belə ki, bu naxışlar tək söz olaraq da işlənmiş, epiqrafik haşiyə ilə çərçivələnmiş kitabə kimi də tətbiq edilmiş, cümlə formasında

epiqrafik yazı olaraq da həkk olunmuşdur. Abidəyə giriş hissə tac elementləri ilə bəzədilmişdir. Məqbərənin çatmatağ şəkilli baştağının (giriş portalının) çərçivəsinə daxil olan, çatmatağçanın yuxarısında yerləşən filenka bəzəyindəki epiqrafik yazısında memarın adı yazılmışdır. Çatmatağçanın hər iki yanı bagetlərlə çərçivələnmişdir. Ondan yuxarıdakı kvadrat formalı meandr ornamenti ilə haşiyələnmiş linteldə isə abidənin tikilmə tarixi verilmişdir. Məqbərənin on səthindəki tağçaları çərçivələyən haşiyələrin hər biri də "Quran" ayələri və surələrlə Π formasında haşiyələnmişdir. Bu yazılar isə eyni şəkildə cülmə naxışı, yəni dairə həndəsi naxışı ilə nəbati naxışının kompozisiyasından yaranan quş gözü naxışı ilə çərçivələnmişdir. Burada işlənmiş islimi naxış növündə lalə, hoya çiçəyi (beşləçəkli çiçək) və spiral şəklində burulmuş budaq və yarpaq motivləri istifadə olunmuşdur (Qənbərova, 2010: 16). Düzbucaqlı tağçaların içərilərinin baş tərəflərindəki zolaqlarda yenə də "Quran"dan ayələr verilmişdir. Tağçaların bəzilərində işlənən şəbəkələrin mərkəzlərində günəş şəklində ornamentin içərisində kufi xətti ilə "Allah" sözü işlənmişdir. Məqbərənin antablementinin ən üst hissəsi sayılan karniz hissə müqarnalı stalaktitlə bəzədilmişdir. Bu hissədə də adi və firuzeyi kaşılı kərpiclər kontaminasiya halındadır. Antablementin karnizdən aşağıda yerləşən digər hissəsində, yəni frizində məqbərənin inşasının əmrini verən hökmdarın adı, tikintini başa çatdıran hökmdarın adı və abidənin kimin şərəfinə tikildiyi göstərilir. Friz hissənin epiqrafik yazısı bütövlükdə firuzeyi kaşı ilə bəzədilmişdir (Səfərli, 2019: 58-65).

Abidənin interyerində günbəzin daxili səthində günəşi, ayı, planetləri təmsil edən 4 ədəd medalyon (xonça) işlənmişdir. Dairəvi formada olan bu qabarıq medalyonlar astral ornamentlər hesab olunurlar. İnteryerdəki bu medalyonlarda həm bitkisəl, həm həndəsi, həm də epiqrafik ornamentlər istifadə olunaraq bütöv bir kompozisiya əmələ gətirmişdir. Həndəsi ornamentlərdən dairə daxilinə çəkilmiş beşbucaqlı, səkkizbucaqlı, beşguşəli ulduz, altıguşəli ulduz, səkkizguşəli ulduz istifadə olunmuşdur. Bu ulduzvari kompozisiyaların içərisində kufi xətli epiqrafik yazı kimi İslam dininin sonuncu peyğəmbərinin, dörd xəlifənin və iki imamın adları həkk olunmuşdur. Bu ornamentlər "S" şəkilli dairəvi meandr formasında spiralvari nəbati naxışlarla haşiyələnmişdir. Dörd medalyonun hər birinin mərkəzinə "Allah" sözü yerləşdirilmişdir (Salamzadə, 1984: 25-28). Aparılan tədqiqatlardan bəlli olmuşdur ki, türbənin interyerində biraz hündürlükdə qurşaq şəklində epiqrafik ornamentlərə daxil olan kufi xətli kitabə mövcud olmuş, lakin restavrasiya zamanı bərpası mümkün olmamışdır. Tədqiqatlar göstərmişdir ki, bu epiqrafik yazı zolağı abı rəngində (su rəngində, açıq mavi rəngdə) kaşı ilə işlənmişdir.

## Nəticə

Beləliklə, tədqiqatlarımızdan da göründüyü kimi Əcəmi Əbubəkr oğlu Naxçıvaninin yaratdığı hər bir əsər böyük estetik həzz mənbəyidir. Bu möhtəşəm arxitektura əsərləri sənətkarın yaradıcı dühasının gücünü əks etdirir. Əcəmi Naxçıvani bu əsərləri yaratmaqla zəmanəmizə ölməz irs buraxmışdır. Memarı bu dünyada ölümsüzləşdirən şey onun yaratdığı əzəmətli memarlıq abidələridir. Əcəmi Naxçıvani böyüklüyü dahi memarın inşa etdiyi əsərlər üzərində həkk olunan ornamentlərdə təşəkkül tapmışdır. Əcəmi Naxçıvaninin tikdiyi bütün memarlıq abidələri üzərində istifadə edilmiş hər bir ornament dərin mənalar kəsb edir. Memar inşa etdiyi abidələrdə memarlıqla ornamentasiyanın sintezini böyük ustalıqla tətbiq etmişdir. Bu abidələri seyr etdikcə Əcəmi elminin fantaziya zənginliyi bariz şəkildə özünü göstərir.

## Ədəbiyyat

1. Bünyadov, Z.M. (1984). Azərbaycan Atabəyləri dövləti (1136-1225-ci illər). Bakı: Elm, 268 s.
2. Salamzadə, Ə.Ə. (2009). Tofiq Rəsulov. Şəbəkə. İstanbul: Mega, 48 s.
3. http://anl.az/down/meqale/medeniyyet/medeniyyet_fevral2009/68703.htm
4. Qənbərova, G. (2008). Azərbaycan memarlıq bəzəyində işlədilən bitkisəl (əyrixətli) naxışlar (XI-XVIII əsr). Azərbaycan Milli Elmlər Akademiyasının Naxçıvan Bölməsinin Xəbərləri. İctimai və humanitar elmlər seriyası. №1. Naxçıvan: Tusi, 330 s.
5. Əliyev, Q. (2007). Memar Əcəmi Naxçıvani yaradıcılığında ahəngdarlıq. Bakı: Şərq-Qərb, 160 s.

6. Salamzadə, Ə.V. (1976). Əcəmi Əbubəkr oğlu və Naxçıvan memarlıq abidələri. Bakı: İşıq, 84 s.
7. Səfərli, H. (2019). Naxçıvan şəhərinin epiqrafik abidələri. Naxçıvan: "Əcəmi" Nəşriyyat-Poliqrafiya Birliyi, 152 s.
8. Qiyasi, C. (2019). Naxçıvanda Atabəylər memarlıq kompleksi. Azərbaycan Memarlar İttifaqı. "Memar" elmi, analitik-informasiya jurnalı, № 21, yanvar
9. Əliyev, Q., Mazanov, B., Əsədov, H. (2022). Orta əsr Naxçıvan türbələrinin memarlıq xüsusiyyətləri və konstruksiyalarının hesablanması. Naxçıvan: "Əcəmi" Nəşriyyat-Poliqrafiya Birliyi, 204 s.
10. Qənbərova, G. (2008). Memarlıq bəzəyində işlədilən həndəsi (düzxətli) naxışlar. Bakı: Azərbaycan Memarlıq və İnşaat Universitetinin Elmi əsərləri, № 2, 186 s.
11. Qənbərova, G. (2007). Azərbaycan memarlıq bəzəyində işlədilən xüsusi fiqurlar. Azərbaycan Milli Elmlər Akademiyasının Xəbərləri: Humanitar elmlər seriyası. № 4. Bakı: Elm, 217 s.
12. Qənbərova, G. (2010). Orta əsr Azərbaycan memarlıq bəzəyində işlədilən əsas naxış növləri. "Körpü" beynəlxalq müstəqil, ictimai siyasi, əbədi nəşr, № 57. Təbriz, 45 s.
13. Salamzadə, Ə.V. (1984). Mömınə Xatun türbəsindəki medalyonların tədqiqi. Azərbaycan abidələri: Elmi-kütləvi məcmuə. 1-ci buraxılış. Bakı: Azərnəşr, 120 s.

Göndərilib: 27.11.2023 Qəbul edilib: 19.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/48-53

**Gülarə Quliyeva**
AMEA İ.Nəsimi adına Dilçilik İnstitutu
dissertant
ms.glary@rambler.ru

# METAFORA KOQNİTİV DİLÇİLİK NÖQTEYİ-NƏZƏRİNDƏN

**Xülasə**

Dilçilik tarixində bir anlayış kimi meydana çıxdığı dövrdən indiyə qədər özündə ehtiva etdiyi məzmun-mündəricə etibarilə metafora çox geniş dəyişikliklərə məruz qalmış, müxtəlif tarixi inkişaf mərhələlərində ona müxtəlif yanaşmalar mövcud olmuşdur. Əgər əvvəllər metaforaya, ənənəvi olaraq, dil sistemində çoxmənalılığın inkişaf mexanizmi və üslubi məcaz kimi yanaşılırdısa, hazırda metafora, ilk növbədə, dildə informasiyanın strukturlaşması vasitəsi kimi, gerçəkliyin obrazlı qavranılmasını əks etdirən, dünyanın metaforik mənzərəsinin milli spesifikasını üzə çıxaran koqnitiv instrument kimi tədqiq edilir. Müasir dövrdə linqvistik-üslubi, struktur-semantik və koqnitiv istiqamətlər metafora hadisəsinin öyrənilməsinin əsas istiqamətləri kimi diqqəti cəlb edir. Bu fakt metaforanı məcaz kimi, nominasiya vasitəsi kimi, eləcə də dünyanın dil mənzərəsini yaratma vasitəsi kimi nəzərdən keçirməyə imkan verir.

***Açar sözlər:*** *metafora, koqnitiv dilçilik, üslubi məcaz, çoxmənalılıq, struktur-semantik istiqamət*

**Gulara Guliyeva**
ANAS Institute of Linguistics named after I.Nasimi
PhD student
ms.glary@rambler.ru

## Metaphor from the point of view of cognitive linguistics

**Abstract**

Linguistics until now, the content it contains-the metaphor has undergone very wide changes, there have been different approaches to it at different stages of historical development. If earlier metaphor was traditionally treated as a mechanism for the development of polysemy in the language system and as a stylistic metaphor, now metaphor is studied primarily as a means of structuring information in the language, as a cognitive instrument that reflects the figurative perception of reality and reveals the National specificity of the metaphorical picture of the world. In modern times, linguistic-stylistic, structural-semantic and cognitive directions attract attention as the main directions of studying the phenomenon of metaphor. This fact makes it possible to consider metaphor as a metaphor, as a means of nomination, as well as as a means of creating a linguistic picture of the world.

***Keywords:*** *metaphor, cognitive linguistics, stylistic metaphor, polysemy, structural-semantic direction*

## Giriş

Koqnitiv dilçilikdə gerçəkliyin kateqoriallaşması problemi əsas yer tutur ki, burada da insan ağlının analogiyalara əsaslanma imkanlarının təzahürü kimi metafora mühüm rol oynayır. Müasir koqnitiv dilçilikdə dünyanı dəyərləndirməyin və təsvir etmənin əsas mental əməliyyatı, idraketmə, kateqoriallaşma, konseptuallaşma üsulu kimi metaforanı qəbul edirlər.

XX yüzillikdə metafora dilçilik üçün elə bir birləşdirici hadisəyə çevrildi ki, onun tədqiqi ilə koqnitiv elmin inkişafının başlanğıcı qoyuldu. Koqnitiv dilçilik çərçivəsində metaforanı təfəkkür üsulu kimi təfərrüatlı nəzərdən keçirən E.Makkormak olmuşdur (Makkormak, 1990: 358-386). Özünün "Koqnitiv metafora nəzəriyyəsi" əsərində alim metaforanı ətraf aləm haqqında yeni

biliklərin əldə edilməsini özündə ehtiva edən idrak prosesinin növlərindən biri kimi xarakterizə edir. Nəzərdə tutulur ki, metaforanın daxili təhlilində koqnitiv proseslərin ehtiva olunduğu aşkarlanır ki, bu da yeni biliklərin əldə olunmasına imkan verir. Makkormaka görə, metaforanın meydana çıxmasının səbəbi insan ağlı ilə semantik konseptlərin həyatda müqayisə edilə bilməyənlərlə müqayisəsidir. Bir tərəfdən, metafora tərkib hissələrin xüsusiyyətləri arasında uyğunluğu, bənzərliyi nəzərdə tutur, çünki o, dərk oluna bilməlidir, digər tərəfdən isə onlar arasında uyğunsuzluq, bənzərsizlik nəzərdə tutulur, çünki metaforanın hansısa yeni məna yaratmaq məqsədi vardır (2).

Metaforanın tədqiqində koqnitiv yanaşmanın ilkin şərti kimi onun mental xarakteri və dərketmə potensialı haqqında müddəa çıxış edir. Təfəkkürün metaforikliyi hadisəsinə bir çox tədqiqatçılar müraciət etmişlər (Deignan, 2003: 255-271; Kovecses, 2000: 79-92; Richardt, 2005: 290; Searle, 1993: 83-111). Onların bir çoxunun tədqiqatları "Metafora nəzəriyyələri" toplusunda yer almışdır (Teoriya metafory: Sbornik, 1990: 512).

Koqnitiv dilçilikdə metaforanın tədqiqində bir çox istiqamətləri fərqləndirmək olar. Onları aşağıdakı kimi qruplaşdırmaq olar:

1. konseptual metafora nəzəriyyəsi.
2. deskriptiv və ya deskriptor metafora nəzəriyyəsi.
3. metaforik modelləşdirmə nəzəriyyəsi.
4. interaksiya nəzəriyyəsi.

Konseptual metafora nəzəriyyəsi müasir dilçilikdə metaforaya yanaşmada əsas nəzəriyyələrdən biri kimi tanınır. Bu nəzəriyyənin və ümumiyyətlə, müasir dilçilik elmində metaforaya linqvokoqnitiv yanaşmanın baniləri kimi C.Lakoff və M.Conson hesab edilir. Onların həmmüəllifliyi ilə dərc olunmuş "Yaşadığımız metaforalar" adlı tədqiqat işi XX yüzilliyin 80-ci illərindən sonra dəfələrlə işıq üzü görmüşdür. Koqnitiv dilçilik üzrə mütəxəssislər C.Lakoff və M.Consonun "Yaşadığımız metaforalar" əsərini metaforaya koqnitiv yanaşmanın "bibliya"sı, koqnitivizmdə Sössürün "Ümumi dilçilik kursu"nun özünəməxsus analoqu adlandırırlar. Bu tədqiqat metaforanın koqnitiv nəzəriyyəsinin əsasını təşkil edir. Bu nəzəriyyədə özünə yer almış "koqnitiv metafora" və "konseptual metafora" terminləri keçmiş sovet dilçiliyində XX yüzilliyin 80-ci illərinin ortalarında dövriyyəyə girmişdir. Əslində bu terminlərin dövriyyəyə daxil olmasına daha çox metafora haqqında xarici müəlliflərin tərcümə əsərləri imkan yaratmışdı. Həmin tərcümə əsərləri koqnitiv dilçiliyin birinci mərhələsi adlandırılan dövrdə fəaliyyət göstərən müəlliflərə məxsus idi və təxminən, 1960-1980-ci illəri əhatə edirdi. Bu istiqaməti təmsil edən bir çox görkəmli nümayəndələrin tədqiqatları "Metafora nəzəriyyələri" toplusunda yer almışdır (Vezhbitskaya, 1990: 133-152; Teoriya metafory: Sbornik, 1990: 512; Ortega-i-Gasset, 1990: 68-81; Richards, 1990: 44-67; Uilrayt, 1990: 82-109). Koqnitiv semantika ideyaları həmin dövrdə N.Xomskinin struktur dilçiliyinin təsiri altına düşmüş Amerika dilçiliyi üçün inqilabi xarakter daşıyırdı. Koqnitiv tədqiqatlar keçmiş sovet məkanında, o cümlədən rus dilçiliyində əks-səda tapdı. Belə ki, dil formasında realizasiyasını tapan ideal mahiyyət (koqnitiv hadisə) kimi metafora haqqında irəli sürülən mühakimə, fikir və ideyalar keçmiş sovet və sonradan rus dilçilərinki ilə səsləşirdi, çünki onlar linqvistik ənənələrə və materializmin ideoloji məqsədlərinə uyğun olaraq dil və təfəkkürün əlaqəsi baxımından düşünməyə alışmışdılar.

Amerika koqnitiv dilçiliyi insanın təfəkkür və təcrübəsini strukturlaşdıran və nizama salan, onun mücərrəd təfəkkürünü formalaşdıran ilkin koqnitiv mexanizm kimi metaforanın aparıcı rola malik olduğunu qeyd edirlər (Johnson, 1990: 272; Lakoff, 1993). Belə bir mühakimə təsdiq edilir ki, metafora təfəkkürü, davranışı, elmi dərrakəni təyin edir və dildə və nitqdə daha əyani şəkildə ifadəsini tapır. Koqnitiv dilçilikdə metafora, hər şeydən əvvəl, ideal hadisə olub "koqnitiv metafora" və "konseptual metafora" terminoloji adını almışdır (Lakoff, 1993). C.Lakoffun fikrincə, metafora "mücərrəd anlayışları dərk etmək və abstrakt fikirləşmək üçün istifadə edilən koqnitiv vasitədir" "*Metaphor is a cognitive tool we use to comprehend abstract concepts and perform abstract reasoning*" (Lakoff, 1993: 244).

Konseptual metafora nəzəriyyəsi XX əsrin ikinci yarısından müxtəlif ölkələrin dilçi tədqiqatçıları arasında kifayət qədər geniş populyarlıq qazanmışdır. Bu nəzəriyyənin əsasında belə

bir mühakimə durur ki, təbiətinə görə metafora elə bir başlıca mexanizmdir ki, onun vasitəsilə biz mücərrəd anlayışları dərk edir və mücərrəd fikir və mühakimələri təsəvvür edirik. Qeyd edilir ki, metafora öz mahiyyətinə görə koqnitivdir, konseptualdır, təbiəti etibarilə dil vasitəsi deyildir, amma metaforik dil koqnitiv, konseptual metaforanın yalnız səthi təzahürüdür. C.Lakoff və M.Consonun fikrinə görə, metaforanın mənası bir predmetin mahiyyətinin digər bir predmetin mahiyyətində hiss və dərk edilməsindədir. Onlar, bir tərəfdən, dilin metaforik strukturu barədə, digər tərəfdən, insanın konseptual sisteminin metaforanın köməyilə strukturlaşması və müəyyənləşməsi barədə tezisi irəli sürür və sübut edirlər (Lakoff, 1999: 640).

Amerika koqnitiv dilçiliyində koqnitiv və konseptual metafora "ya neyron, ya da konseptual səviyyənin reallığı" ("a reality at either the neural or conceptual level") (Lakoff, 1999: 58) olması səbəbdən qəbul edilir. C.Lakoff və M.Conson əsərinin 4-cü fəslində şərh edirlər ki, *həmin terminlər baş beynin fəaliyyətinin iki səviyyəsinə aiddir* (Lakoff, 1999: 45-59). Koqnitiv metafora bir mexanizm olaraq neyron əlaqələrinin aktivləşməsi səviyyəsində baş verən proseslərlə, konseptual metafora insan təfəkkürünün anlayış, mühakimə səviyyəsi ilə əlaqəlidir. Birincinin "məskunlaşma yeri" baş beynin neyrofizioloji substratı, ikincininki isə anlayış təfəkkürü, əqli fəaliyyətdir. Konseptual metafora dildə və nitqdə linqvistik (dil) metaforası ilə obyektivləşir, əksi mümkün deyil. Linqvistik metaforalar (metaforik ifadələr, obyektivləşmə, reflekslər) əsasında təfəkkürdə metafora, koqnitiv metaforik proseslər haqqında dolayısı ilə mühakimə yürütmək olar. Metafora, hər şeydən öncə, təfəkkürdədir, sonra praktik fəaliyyətə, o cümlədən nitq fəaliyyətinə keçir. Koqnitiv və konseptual metafora bu şəkildə Amerika koqnitiv dilçiliyində və ABŞ hüdudlarından kənarda bu istiqamətin ardıcılları tərəfindən qəbul edilir. Koqnitiv və ya konseptual metafora keçmiş sovet dilçiliyində yalnız adına görə vardı, onun nə məqsədləri, nə də tədqiqat metodları vardı. Keçmiş sovet tədqiqatçıları ilə onların xarici həmkarlarını birləşdirən ümumi olan cəhət dil və təfəkkürün qarşılıqlı əlaqələrinin qəbul edilməsi idi. "Əgər amerikalılar üçün bu ideya generativ dilçilikdən koqnitiv semantikaya keçidlə yad edilən inqilabi nailiyyət idisə, dil və təfəkkürün əlaqəsinin qəbul edilməsindəki prioritet, o cümlədən semantikanın bir çox məsələlərinin işlənib-hazırlanması, şübhəsiz, sovet dilçiliyinə məxsus idi (amma sovet dövrünün elmi uğurları ölkə hüdudlarından kənara çıxmırdı)" (Kul'chitskaya, 2012: 85-90).

Konseptual metaforanın əsasını konseptual sahələr vasitəsilə inikas və proeksiya təşkil edir. Bu inikaslar qeyri-simmetrikdir və tam deyildir. Hər bir inikas mənbə-sahədəki mahiyyətlərlə hədəf-sahədəki mahiyyətlər arasında invariantlıq prinsipi əsasında ontoloji uyğunluqların təsbit edilmiş dəstidir. İnvariantlıq prinsipi mənbə-sahə strukturunun öz strukturuna malik hədəf-sahəyə proyeksiyasından ibarətdir. Hər bir metaforik inikas metaforik anlayış və ya konseptə əsaslanır ki, bu da insanın idrak prosesində formalaşır, fiziki və mədəni əsasa malik olmaqla sosial cəhətdən motivli olur. Konseptual metafora nəzəriyyəsinin müəllifləri inikasın iki tipini fərqləndirirlər. Konseptual-koqnitiv metaforalar və obraz-inikaslar. Bu zaman konseptual metafora ontoloji, struktur və oriyentasion metafora kimi başa düşülür. Beləliklə, metaforanın ikili təbiəti aşkarlanır. Bu o deməkdir ki, metafora eyni zamanda gerçəkliyin obrazlı inikası olmaqla yanaşı həm də fərdin koqnitiv strukturunun elementidir (Kassirer, 1990: 33-43).

Konseptual metafora nəzəriyyəsinə əsasən metaforikləşmə və ya metaforizasiya biliyin iki struktur növünə əsaslanır: *mənbə sahəsi* ("source domain") koqnitiv strukturu və *hədəf sahəsi* ("target domain") koqnitiv strukturu. Metaforikləşmə prosesində müəyyən hədəf sahələr mənbə sahələrin nümunəsi üzrə strukturlaşır.

Başqa sözlə, *metaforik proyeksiya* ("metaphorical mapping") və koqnitiv inikas ("cognitive mapping") baş verir. Metaforik proyeksiyanın izləri metaforik nəticələr şəklində cümlənin və ya mətnin semantikası səviyyəsində aşkarlanır. Məsələn, ... *hər bir keçid dövründə xalqların kütləyə çevrilməsi prosesi olur. Biz yuxarıların ölümcül oyunları üçün yalnız lal sürü rolunu oynayırıq* kimi fikir və ifadələrdə *xalq // cəmiyyət // toplum* (hədəf) – *kütlə // sürü* (mənbə) metaforası adresatın diqqətini "asılılıq, qeyri-müstəqillik, passivlik" ideyasına, fikrinə yönəldir ki, bu da "sürü" koqnitiv strukturunun tərkib hissəsi kimi çıxış edir: dünya haqqında biliklərimiz bizə deyir ki, *sürü* çoban tərəfindən idarə olunur (Lakoff, 1999: 60).

Son illərdə konseptual metafora nəzəriyyəsi üzrə meydana çıxan araşdırmalarda (Kovecses, 2000: 79-92; Lakoff, 1999: 60) tədqiqatçılar belə bir fakta diqqət yetirirlər ki, metaforik təfəkkür və dilin əsasında dayanan əsas proyeksiyaların böyük əksəriyyəti çox böyük dərəcədə təcrübəyə əsaslanır və çox az dərəcədə təfərrüatlıdır. Metaforanın təcrübi əsasa dayanma dərəcəsindən asılı olaraq metaforik proyeksiyalanmanın iki növü fərqləndirilir: mürəkkəb və ya tərkibi (complex, compositional, compound) metaforalar və onların tərkibinə daxil olan sadə və ya ilkin (primary, simple, primitives) metaforalar. İlkin metaforalar bilavasitə təcrübə ilə assosiasiya edilən konseptual sahələrə metaforik proyeksiya nəticəsində meydana çıxır. İlkin metaforalarda metaforik proyeksiyalar konseptual işlənmənin daha aşağı səviyyələrində baş verir. Bu səbəbdən onların doğurduğu obrazların konkretliyi daha az olur. C.Lakoff və M.Conson belə hesab edirlər ki, *ilkin metaforaları toplu halda molekulları təşkil edən atomlara bənzətmək olar. İnsanın konseptual sistemində konvensional (şərti) olan bu tip "molekul" metaforalarının sayı çoxdur. İlkin metaforalardan əlavə, mürəkkəb konvensional metaforaların tərkibinə konkret, müəyyən sosio-mədəni birliyə xas olan inam və ənənələr, mədəni modellər, "sadəlövh" nəzəriyyələr kimi adi, gündəlik biliklər daxildir* (Lakoff, 1999: 60).

Tədqiqatçılar hesab edirlər ki, *ilkin metaforalar universal olur, sayı çox olmur, amma mürəkkəb metaforalar bir neçə ilkin metaforadan ibarət olduğuna görə, xeyli dərəcədə mürəkkəbliyi və konkret mədəniyyətə xas olması ilə fərqlənir* (Grady, 1996: 177-187; Evans, 2004: 177-187). Məsələn, Con Miltonun 7-ci sonetinin "How soon hath Time, the subtle thief of youth Stol'n on his wing my three-and-twentieth year!" misralarını təhlil edən C.Lakoff və M.Terner buradakı metaforik köçürmənin tipini TIME IS A THIEF (*Zaman bir oğrudur*) konseptual metaforasının realizəsinə aid edirlər (Lakoff, 1989: 168). Həmin metaforada mənbə-sahə kimi "oğurluq" domeni, "zaman" isə hədəf-sahə kimi çıxış edir. TIME IS A THIEF metaforası tərkibi (composite) metafora olub, TIME IS A CHANGER (*Zaman dəyişdirəndir*) və LIFE IS A POSSESSION (Həyat sahib olmaqdır) ümumi metaforaların birləşməsindən meydana çıxmışdır. Metaforik proyeksiyanın əsasında həyatın qiymətli mal, mülk, sərvət olması barədə mövcud təsəvvür dayanır; zamanın ayrı-ayrı hissələri və ya kəsikləri də insanın var-dövləti və ya mal-mülkü kimi qavranılır. Zamana sahib olmaqdan əlavə, insan həyatının müəyyən dövrlərində güc, gənclik, gözəllik kimi müxtəlif keyfiyyətlərə malik olur. Bu sadalananların hamısı mal, mülk kimi təsəvvür edilir ki, bu səbəbdən oğurlana bilər. Metaforikləşmənin əsası ondan ibarətdir ki, həyat, həyatın mərhələləri, gözəllik, güc və gənclik kimi keyfiyyətlər zamanın geridönməz gedişatı sayəsində labüdən mövcudluğunu dayandırır. Beləliklə, zamanın gedişatı baş verənlərin səbəbi kimi qəbul edilir, zaman metaforik subyekt, hadisə isə subyektin əməlləri kimi göz önünə gəlir. Həyat və onun hissələri, parçaları insanın var-dövləti, mülkü kimi təsəvvür edildiyinə görə, onların yox olması itki, zərər kimi, zərəri vuran şəxs isə oğru olaraq konseptuallaşdırılır.

Metaforaya linqvo-koqnitiv yanaşmada dilin lüğət tərkibində leksik vahidlərin fəaliyyətində, gerçəkliyin metaforik inikas qanunauyğunluqlarında sistemli əlaqələrin formalaşmasında koqnitiv strukturların roluna böyük əhəmiyyət verilir. Bu yanaşmanın ayrı-ayrı ideyalarını müasir dövrdə hətta metaforaya semasioloji yanaşma tərəfdarları da qəbul edirlər. Məsələn, V.Q.Qak "metafora insan idrakının dərin xüsusiyyətləri sayəsində meydana gəlir" fikrindədir (Gak, 1988: 11). V.N.Teliya hesab edir ki, *dil strukturunun önəmli səviyyələrinin hamısında – leksik, sintaktik və morfem – mənayaratmanın ən məhsuldar üsullarından biri məhz metaforadır* (Teoriya funktsional'noy grammatiki, 1990: 173-174).

Deskriptiv (və ya deskriptor) metafora nəzəriyyəsi A.N.Baranovun adı ilə bağlıdır. Deskriptiv nəzəriyyə koqnitiv metafora nəzəriyyəsinə əsaslansa da, burada başqa kateqorial aparatdan istifadə edilir. Həmin kateqorial aparat metaforanın işlənmə kontekstlərinin maşın vasitəsilə emalında daha rahat hesab edilir. Koqnitiv metafora nəzəriyyəsini inkişaf etdirməklə, A.N.Baranov inikas funksiyasının "çıxış sahəsi" ilə onun "giriş sahəsi" arasında metaforik proyeksiya olduğunu aşkarlayır. Çıxış sahəsi ilə giriş sahəsinin qarşılıqlı əlaqəsində daha az stabil yaradıcı metaforalardan tutmuş cəmiyyətin mədəni ənənələrində təsbit olunmuş sabit işlənmiş (köhnəlmiş) metaforalara qədər müxtəlif variasiyalar yarana bilir (Baranov, 2003: 76). Çıxış və təyinat

sahələrinin elementləri mürəkkəblik dərəcəsinə görə müxtəlif ola və metaforik proyeksiyada, yəni öz mənalarında birmənalı olmaya bilər. Bu hadisəni A.N.Baranov metaforanın "koqnitiv sayrışması" hesab edir. Müəllif metaforanın təsviri üçün semantik deskriptorlar dilini dövriyyəyə daxil edir. Çıxış sahəsi üçün siqnifikativ deskriptorlar, hədəf sahə üçün denotativ deskriptorlar nəzərdə tutulur. Deskriptorları "normaya salınmış leksem altçoxluqları" təmsil edir ki, onlar üçün çoxmənalılıq, omonimlik, sözdəyişmə xüsusiyyətləri səciyyəvi deyildir (Baranov, 2004: 79).

## Nəticə

Deskriptiv metafora nəzəriyyəsində metafora siqnifikativ və denotativ deskriptorlar çoxluğu kimi təsvir edilir. Həmin deskriptorlar isə müvafiq olaraq mənbə sahəsini və hədəf sahəsini təmsil edir. Məsələn, *qanunların müharibəsi* metaforası deskriptiv metafora nəzəriyyəsində aşağıdakı tipdə olan ikielementli çoxluq şəkilində təsəvvür edilir: {<müharibə>, <qanunvericilik fəaliyyəti; qanunvericilik>}. Birinci deskriptor, yəni "müharibə" siqnifikativ, ikinci, yəni "qanunvericilik fəaliyyəti", "qanunvericilik" isə denotativdir. Siqnifikativ və denotativ deskriptorların metadilindən istifadə edilməsi metaforaların işlənmə kontekstlərini oxşar, uyğun şəkildə təsvir etməyə və kompüter proqramları vasitəsilə emal etməyə imkan verir.

Bir-biri ilə tematik şəkildə əlaqəli olan siqnifikativ deskriptorlar sahəsi "metaforik modellər"i (M-modelləri) əmələ gətirir. Məsələn, hərbi əməliyyat, ordu semantikası olan siqnifikativ deskriptorlar "Müharibə" metaforik modelini əmələ gətirir; yaxud tematik cəhətdən qohumluq münasibəti ilə əlaqəli deskriptorlar "Qohumluq münasibətləri" metaforik modelini formalaşdırır və s. Hər bir M-model iyerarxik cəhətdən sıralanmış, nizamlanmış siqnifikativ deskriptorlar ağacı kimi təsvir olunur.

Deskriptiv metafora nəzəriyyəsi daha çox metaforanın kontekst istifadəsinin tezlik parametrlərinin təhlilinə yönəlir, burada metaforanın sosiolinqvistik təsviri və şərhi nəzərə alınmır.

## Ədəbiyyat


1. Makkormak, E. (1990). Kognitivnaya teoriya metafory. Teoriya metafory. Moskva: Progress, s.358-386.
2. Kognitivnaya metafora. https://ru.wikipedia.org/wiki/%d0%9a%d0%
3. Deignan, A. (2003). Metaphorical expressions and culture: An indirect link. Metaphor and Symbol, 18(4), pp.255-271.
4. Kovecses, Z. (2000). The scope of metaphor. Metaphor and Metonymy at the Crossroads. A Cognitive Perspective ed. by A.Barcelona – Berlin; New York: Mouton de Gruyter, pp.79-92.
5. Richardt, S. (2005). Metaphor in languages for spécial purposes. Berlin: Peter Lang, 290 p.
6. Searle, J.R. (1993). Metaphor. Metaphor and thought, edited by A.Ortony. Cambridge: Cambridge University Press, pp.83-111.
7. Teoriya metafory: Sbornik. (1990). Obshch. red. M.A.Zhurinskaya [i dr.]. Moskva: Progress, 512 s.
8. Vezhbitskaya, A. (1990). Sravneniye-gradatsiya-metafora. Teoriya metafory. Moskva: Progress, s.133-152.
9. Ortega-i-Gasset, X. (1990). Dve velikiye metafory. Teoriya metafory. Moskva: Progress, s.68-81.
10. Richards, A. (1990). Filosofiya ritoriki. Teoriya metafory. Moskva: Progress, s.44-67.
11. Uilrayt, F. (1990). Metofora i real'nost'. Teoriya metafory. Moskva: Progress, s.82-109.
12. Johnson, M. (1990). The Body in the Mind: The Bodily Basis of Meaning, Reason and Imagination. Chicago: Chicago University Press, 272 p.
13. Lakoff, G. (1993). The Contemporary Theory of Metaphor. Metaphor and Thought / edited by A.Ortony. Cambridge: Cambridge University Press, pp.202-15.
14. Lakoff, G. (1999). Philosophy in the Flesh: The Embodied Mind and Its Challenge to Western Thought. New York: Basic Books, 640 p.
15. Kul'chitskaya, L.V. (2012). Ponyatiye "kognitivnaya" i "kontseptual'naya" metafora v otechestvennoy lingvistike rannekognitivnogo perioda: [Elektronnyy resurs] Vestnik Buryatskogo

gosudarstvennogo universiteta. Vyp. 11: Romano-germanskaya filologiya, s.85-90. URL: https://cyberleninka.ru/ article /n/ponyatiya-kognitivnaya-i-kontseptualnaya-metafora-v-otechestven-noy-lingvistike-rannekognitivnogo-perioda.

16. Kassirer, E. (1990). Sila metafory. Teoriya metafory. Moskva: Progress, s.33-43.
17. Kovecses, Z. (2000). The scope of metaphor. Metaphor and Metonymy at the Crossroads. A Cognitive Perspective / ed. by A.Barcelona**.** Berlin; New York: Mouton de Gruyter, pp.79-92.
18. Grady, J. (1996). Primitive and Compound Metaphors. S.Taub, P.Morgan. Conceptual Structure, Discourse and Language – California: CSL1 Publications Stanford, pp.177-187.
19. Evans, V. (2004). The Structure of Time. Language, meaning and temporal cognition. Amsterdam; Philadelphia: John Benjamins Publishing Company, 286 p.
20. Lakoff, G. (1989). More than Cool Reason. M.Turner. Chicago and London: The University of Chicago Press, 237 p.
21. Gak, V.G. (1988). Metafora: Universal'noye i spetsificheskoye. Metafora v yazyke i tekste. Moskva: Nauka, s.11-26.
22. Teoriya funktsional'noy grammatiki. (1990). Temporal'nost'. Modal'nost'. Otv. red. A.V.Bondarko. Leningrad: Nauka, 263 s.
23. Baranov, A.N. (2003). O tipakh sochetayemosti metaforicheskikh modeley. Moskva: Voprosy yazykoznaniya. № 2, s.73-94.
24. Baranov, A.N. (2004). Predisloviye redaktora. Dzh.Lakoff, M.Dzhonson. Metafory, kotorymi my zhivem. Moskva: Yeditorial URSS, s.7-22.

Göndərilib: 15.12.2023 Qəbul edilib: 04.02.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/54-59

**Vüsalə Həsənova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti Şəki filialı
dissertant
vusalahasanova1986@gmail.com
https://orcid.org/0000-0003-3529-032X

# TƏMƏL SAVAD, KOMPİTENSİYALAR VƏ ŞƏXSİ KEYFİYYƏTLƏRİ EHTİVA EDƏN, XXI ƏSR BACARIQLARINI FORMALAŞDIRAN TƏLİM MODELİ

**Xülasə**

Artıq 20 ildən çoxdur ki, mövcud ümumi təhsil proqramlarının cəmiyyətdə yeni ictimai münasibətlərin yaranması, dünya təsil sisteminə inteqrasiya, informasiya əsrinin tələbləri, planlı iqtisadiyyatdan bazar iqtisadiyyatına keçiddə müasir tələblərə cavab verməməsi səbəbli Azərbaycanda ümümi təhsilin məzmununda keçirilən silsiləli olaraq "Azərbaycan Respublikası ümümi orta təsilin dövlət standartları", "Azərbaycan Respublikası ümümi təhsilin kompitensiyaları (Milli kurrikulum)" və "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları" adlı islahatlar fonunda yenilənir. Dəyişən programlar, monoton nəzəri bacarıqları formalaşdıran modellərin, tələb olunan bilik və bacarıqları formalaşdıran yeni modellərlə əvəzlənmə kimi tələbləri də öz bərabərində gətirir. Xidməti Öyrənmə, 21-ci əsr bacarıqlarını həqiqi mənada formalaşdıran təlim moldeli olaraq istənilən fənnə və mövzuya tətbiq oluna bilən model kimi gözdən keçirilə bilər.

***Açar sözlər:*** *21-ci əsr bacarıqları, Xidməti Öyrənmə modeli, modelin mərhələləri, modelin növləri, üstünlüklər, çatışmazlıqlar*

**Vusala Hasanova**
Sheki branch of Azerbaijan State Pedagogical University
Phd student
vusalahasanova1986@gmail.com
https://orcid.org/0000-0003-3529-032X

## A learning model that builds 21st century skills including basic literacy, competences and personal qualities

**Abstract**

For more than 20 years, due to the emergence of new social relations in the society, integration into the world education system, the requirements of the information age, and the failure of the existing general education programs to meet modern requirements in the transition from a planned economy to a market economy, a series of "State Standards of the General Secondary Education of the Republic of Azerbaijan", "Competencies of general education of the Republic of Azerbaijan (National curriculum)" "State standard and programs of general education level" programs have been applied systematically. Changing programs entail the replacement of models that form monotonous theoretical skills with new models that build the required knowledge and skills. Service learning can be viewed as a learning model that truly builds 21st century skills and can be applied to any discipline or subject.

***Keywords:*** *21st century skills, Service Learning model, stages of the model, types of the model, advantages, disadvantages*

## Giriş

Experimental təlimin geniş istifadə olunan modellərindən biri olan, mənalı və məqsədyönlü şəkildə cəmiyyətə xidməti təlim proqramı ilə əlaqələndirən Xidməti Öyrənmə (XÖ) yaşadığımız cəmiyyətə xidmət və bu məşğuliyyətin nəticələrinin dərindən düşünülərək təfəkkürdə inikasının

formalaşması kimi iki əsas hissədən ibarətdir. Bu tərkib hissələr tələbələrin cəmiyyətin ehtiyyaclarına cavab verəcək şəkildə tərtib olunmuş xidmət fəaliyyətində iştirakı və tədris materialının daha dərindən başa düşülməsi, disiplinin qiymətləndirilməsi və vətəndaş məsuliyyəti hissinin təkmilləşdirilməsi üçün tərtibli xidməti fəaliyyət üzərində refleksiyası fonunda balanslaşdırılaraq həyata keçirilir (Bringle, Hatcher, 1995: 112). XÖ modelinin məzmununu təlim forması və təlim fəsəfəsi adlarıyla iki cür müəyyən etmək olar. Təlim forması kimi dəyərləndirmə onu digər eksperimental təlim formalarından fərqləndirən dərin refleksiya, həqiqi həyatın öyrənilməsi və uyğun xidməti ehtiva etməsidir. Tələbələrin refleksiyası nəzəriyyə və praktiki bacarıqların bütünləşməsini təşviq edir. Real həyat situasiyalarına tətbiq, tələbələrin gələcək kariyera hədəflərində tamamlayıcı rol oynamalı olduğuna görə, seçilmiş xidmət uyğun, mənalı, kurrikulumla sıx bağlı olmalıdır. XÖ mücərrəd və konkret biliyin balansını nümayiş etdirməklə yanaşı sosial bilgi və vətəndaş məsuliyyətini inkişaf etdirməlidir. XÖ fəlsəfəsi isə insanın yetişməsi və məqsədi, ictimai baxış, icma ilə yaxınlaşma və bilginin inteqrasiyasını ehtiva edir (Kendall, 1990: 23). XÖ modeli ictimai reallıqda dəyişiklikliyə səbəb ola bilər. XÖ konkret təcrübələri məcazi nəzəri anlayışlarla əlaqələndirib güc və dəyişiklik anlayışlarını genişləndirdiyi üçün ənənəvi radikal və tənqidi pedaqogikaya aid edilir. XÖ tələbələr müəllimlər və icmalar arası ünsiyyət üçün ilkin şərt olaraq dəyərləndirilən dialoqa əsaslanır.

XÖ təlim modelinin nə olduğu haqda fikrimizi ən çox istinad olunan tərifi ilə yekulaşdırsaq, XÖ tələbələrin müəyyənləşmiş icma ehtiyacına cavab verən təşkil olunmuş xidmət fəaliyyətində iştirakı, nəticədə təlim materialının və nizam-intizamın daha çox başa düşüldüyü, insani dəyərlərin və vətəndaşlıq məsuliyyətinin önə çəkildiyi, təlim prosesində öyrənilən materiala əsaslanan, kredit saatları çərçivəsində reallaşan təlim təcrübəsidir (Bringle, Hatcher, McIntosh, 2006: 5-15). Deməli, bu xidmət təcrübəsi təlim və onun nəticələri ilə birbaşa bağlı olmaqla yanaşı, əməkdaşlıq edilən icmanıın ehtiyacları aydın şəkildə müəyyənləşdirməlidir. Təlimin yeni xarakter qazandığı bu modelin gözəlliyi odur ki, proses zamanı real və konkret bir şey baş verir. Mövzu ilə intellectual və emosiyonal şəkildə məşğul olan tələbələr əvvəl ayrı olan iki ideyanı aydınlaşdırır və əlaqələndirir. Təlim prosesində öyrənilən material artıq öz mənasını praktiki tətbiqlə qazanır və həm zehinlərini həm də mənəviyyatını oyadır (Kaye, 2004: 8-12). Hazırlıq və ya araşdırma, fəaliyyət, refleksiya və nümayiş mərhələlərini özündə birləşdirən XÖ modelinin hər mərhələsi konkret planlaşdırılmış addımlar üzrə reallaşdırılır. Araşdırma və hazırlıq mərhələsində icmanın ehtiyacı və təklif olunacaq bacarıq, maraq və istedad kimi resurslar araşdırılır. Araşdırma mərhələsi müsahibə, sorğu, kitab, internet resursları, şəxsi müşahidələr fonunda yerinə yetirilir və komanda işi tələb edir. Təlim hədəfləri ilə əlaqəli bilik və bacarıqların öyrənilməsi və qazanılmasından ibarət olan bu mərhələdə müəyyənləşdirilmiş icma ehtiyacı sənədləşdirilir. Komandanın tərkib hissələrindən biri kimi müəllim, uyğun təlim nəticəsi fənnlərarası, tələbələrin maraqları, müəyyən edilmiş uyğun akademik məzmun və icma ehtiyacı arasında uyğun çarpaz inteqrasiyanı müəyyən edir. Kiçik qruplara bölünən tələbələrin vəzifələri, məsuliyyətləri və əvvəldən mövcud bacarıqları aydınlaşdırılır və layihənin proqram saatları konkretləşdirilir. Hər qrupun icmanın müəyyən edilmiş ehtiyacına köklənməsi qruplar tərəfindən onların bilik və bacarıqlarını fonunda müəyyənləşdirilmiş fərqli mövqeləri yaradır ki, bu da öz növbəsində problemin təməlində duran istər tarixi və social, istərsə də mədəni, iqtisadi və siyasi kontekstin daha dərindən öyrənilməsinə şərait yaradır (Jacoby, 2014: 3).

Fəaliyyət mərhələsində, planlaşdırılmış layihə üzrə tələbələr yenicə öyrənilmiş bilik və bacarıqların tətbiq olunduğu, öyrəndiklərinin öz anlamını qazanacağı uyğun və mənalı xidmət yerinə yetirirlər. Fəaliyyət, tələbələrin birbaşa nəticə aldıqlarına görə daha çox sevdiyi bilavasitə, problemin həlli istiqamətində yönləndirmə resurslarının və daha çox insanın cəlb olunduğu bilvasitə və demokratik vətəndaşlıq istiqamətində fəal iştirakı ehtiva edən sivil fəaliyyət olmaqla üç əsas üsulla həyata keçirilir (Fertman, 1994: 13). Fəaliyyət növündən asılı olmadan model əməkdaşlıq çərçivəsində, təhlükəsiz şəkildə və potensial səhvlərdən nəticələr çıxararaq inkişafı təmin edir.

Başqalarının ehtiyaclarına empatiyanı formalaşdıran refleksiya həyata keçiriləcək xidmətdən əvvəl, xidmət ərzində və sonda baş verir və XÖ bütün mərhələlərini əlaqələndirir. Qiymətləndirmə

üçün bir struktur təmin edərərək, nəzəriyyələrin və konsepsiyaların praktikada möhkəmlənməsinə və davamlı olaraq düşüncənin güclənməsinə səbəb olan (Heyer, 2015: 15-17) refleksiyanın tədris prosesinin istənilən hissəsində əhəmiyyətini danılmazdır və əgər bu həm fərdi həm də qrup refleksiyasını birləşdirirsə burda təcrübə və məqsəd emosional, koqnitiv və social xüsusiyyətləri daha böyük kontekstə daşımaq imkanı verir. Bu çoxşaxəli refleksiyalar həm onlayn diskussiyalar, refleksiya jurnallarında xırda məqalələr, portfolio, rollu oyunlar fonunda tələbələrin akademik biliyini yoxlamağa, tənqidi refleksiya fonunda isə tələbələrin xidmətlərinin icmaya və özlərinə təsirini dərk etmək imkanı verir. Freirenin təbirincə tələbələr həm sözləri, həm dünyanı oxumağı öyrənir (Freire, 1972: 178).

Nümayiş mərhələsində bütün proyekt nəticələri ilə birlikdə sənədləşdirilir və təqdimatlar, bloqlar, video format şəklində nümayiş etdirilir.

Danılmazdır ki, Xidməti Öyrənmə tələbələrin bacarıqlarını inkişaf etdirməsi və cəmiyyətə müsbət töhfə verməsi üçün əvəzsizdir. XÖ modelini ilk növbədə tələbələr və daha sonra onların xidmət etdikləri icmalara birbaşa fayda verir. Belə ki, tələbələr təhsil sahəsində praktiki təcrübə qazanır, ünsiyyət, komanda işi, problemlərin həlli və liderlik kimi mühüm peşəkar bacarıqları formalaşdırır. Bundan əlavə, o, şəxsi müstəvidə inanılmaz dərəcədə faydalı ola biləcək vətəndaşlıq anlayışının tam anlaşılması üçün fürsət təmin edir. XÖ öyrəndikləri bilik və bacarıqları icmanı mariflәndirmək üçün istifadə edərək *icmaya təsir,* təlim müddətində öyrəndiklərini yerli təşkilatla əməkdaşlıq çərçivəsində real həyat vəziyyətlərinə tətbiq etməklə materialı dərindən dərk etmə fonunda *real dünya tətbiqi*, empatiya, şəfqət və sosial məsuliyyət hissinin inkişafına töhvə verəcək müxtəlif mənşəli şəxslərlə birbaşa qarşılıqlı əlaqə vasitəsilə daha geniş perspektiv əldə etməyə və müxtəlifliyə daha çox qiymət verməyə sövq edən *şəxsi inkişaf,* tələbələrin tapşırıqları koordinasiya etdiyi və həmyaşıdları ilə səmərəli ünsiyyət qurduğu üçün əməkdaşlıq bacarıqlarını artıra bildiyi *bacarıqların inkişafı*, müxtəlif peşə və sənaye sahələri ilə tanışlıq vasitəsiylə, potensial karyera yollarını müəyyənləşdirərək gələcək karyera hədəfləri ilə bağlı əsaslandırılmış qərarlar qəbul edə biləcəkləri *karyera kəşfiyyatı,* layihələrdə iştirak edərək vətəndaşlıq borcu hissi və cəmiyyətdə müsbət dəyişiklik yaratmaq öhdəliyi formalaşdıran *vətəndaş öhtəliyi,* icma təşkilatları, dövlət qurumları və peşəkarlarla əməkdaşlıq *şəbəkə imkanları,* mədəni anlaşma və hörməti təşviq edərək mədəni müxtəlifliyə daha çox qiymət verməyi və multikultural şəraitdə naviqasiya etməyi öyrədən *mədəni maariflәndirmə,* başqalarının rifahına töhfə verdiyini və müsbət fərq yaratdığını bilərək özünə hörməti və ümumi rifahı artıran *fərdi təkmilləşmə* kimi faydalar təmin edir (Aslanargun, 2012: 113).

XÖ modeli nə qədər çoxşaxəli üstünlüyə sahib olsa da onun da təbii ki çatışmazlıqları var. Kurs işləri və digər öhdəlikləri olan tələbkar akademik iş yükü ilə pararlel proyekt işini də tarazlaşdırmaq əlavə stresə və potensial yüklənməyə səbəb ola bilər ki, bu da ümumi rifaha təsir edən *vaxt öhdəliyi,* layihələrin yerinə yetirilməsi çərçivəsində kampusdan kənar yerlərə nəqliyyatın və cədvəllərin təşkili, lazımi resursların təmin edilməsi və bütün iştirakçı tərəflər arasında effektiv ünsiyyətin təmin edilməsi kimi hallar *logistik çətinliklər*, imkanların bütün tələbələr üçün eyni dərəcədə əlçatan olmaması sosial-iqtisadi status və ya coğrafi yer kimi amillərə əsaslanan bərabərsizliklər, imkan məhdudiyyəti ilə bağlı potensial maneələr yarada və şəxsi və akademik inkişaf imkanlarını məhdudlaşdıra bilən *imkanların qeyri-bərabər bölüşdürülməsi,* layihələrin icma tərəfindən idarə olunması, mədəni cəhətdən həssas olması və icma üzvlərinin uzunmüddətli rifahının prioritet olmasının təmin olunması, əməkdaşlıq düşüncəsi ilə yanaşmaqda nasazlıqlar potensial *istismar riski*, proqramının strukturundan asılı olaraq, təlimatın olmaması öyrənmə təcrübəsinə mane olan *məhdud nəzarət və dəstək, q*eyri-adekvat planlaşdırma, resursların çatışmazlığı və ya qeyri-kafi əməkdaşlıq kimi amillər xidmət təşəbbüslərinin effektivliyinə xələl gətirə bilən *səmərəlilik potensialı*, yoxsulluğun, əzabın və ya ədalətsizliyin şahidi olmaq kimi emosional cəhətdən çətin vəziyyətlər *emosional çətinliklər və müvafiq dəstək mexanizmləri,* ənənəvi qiymətləndirmə metodları XÖ modelinin bütöv təsirini və transformativ xarakterini adekvat şəkildə əks etdirməyə bilər, bu da nailiyyətlərin dəqiq qiymətləndirilməsini çətinləşdirən *qiymətləndirmə,* mənalı

təcrübədən çox əlavə tələblər və ya öhdəliklər kimi qəbul etmə, potensial faydalara mane olan, şəxsi və akademik inkişafını məhdudlaşdıra bilən *müvafiq məsuliyyət azlığı* tipli çətinliklər yarada bilər.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı tələbələri ilə edilmiş eksperimental XÖ modeli və nəticələri.

Filialın üçüncü il Xarici dil (İngilis dili) tələbələrinin Dil Bacarıqları fənni üçün təyin olunmuş tədris materialının "Health and İllness" bölməsində, danışıq bacarığının inkişafını hədəfləyən sualların müzakirəsi əsnasında, tələbələrdən birinin ailənin ən yaxın fərdlərində birində mövcud irsi xəstəliyin təəssüf fonunda dilə gətirməsi tələbələrin diqqətini çəkdi. Əvvəllər hər hansı bir irsi xəstəliyin ailə fərdlərinə həm emosional, həm də maddi cəhətdən bu qədər çətinlik yaşatdığından bixəbər olan tələbələrin marağı artıq iki ildən daha çox The Complete Guide to Service Learning (Catheryn Burger Kaye) kitabı ilə tanış olan müəllimin diqqətini çəkir. Problemin hərtərəfli öyrənilməsi eksperiment olaraq həyata keçiriləcək proyekt işi üçün həm özlərinin, həm də xəstəliyin geniş yayıldığı Şimal Qərb bölgə sakinləri və tələbələr üçün mariflənmə və mariflәndirmə yönümlü üstündə işləməyə və vaxt sərf etməyə dəyər bir mövzu olduğuna qərar verilir.

Növbəti 6 həftə üçün planlaşdırma və iş bölgüsü akademik saatlardan kənar təyin olunmuş vaxtlarda dəqiqləşdirilir. İlkin olaraq birinci həftə Talassemiya xəstəliyinin tarixi, ikinci həftə bu xəstəlik üzrə elm sahəsinə töhvə verən dünya və yerli alimlər internet resursları və tibbi ədəbiyyatlardan istifadə edərək araşdırılır və konkret materiallar həm Azərbaycan həm İngilis dillərində təqdimata hazırlanır. Sokratik müzakirə modeli vasitəsiylə refleksiya fonunda diskussiyalar aparılır və hazırlanmış material müzakirə edilir. Üçüncü həftə şəhər sakinlərinin məsələ ilə bağlı nə qədər məlumatlı olduğunu aydınlaşdırmaq üçün –Talasemiya nədir? sualına cavab axtaran tələbələr tərəfindən həvəskar mikrafonlar və kameralardan istifadə ilə lentə alınır. Material filial tərkibində tələbələrə paylanmış sorğu vərəqləri vasitəsiylə toplanılmış statistic nəticə ilə birləşdirilərək problem haqqında fərqindəlik faizi çıxarılır və aşağı faiz göstəricisi proyekt üstündə işləyən tələbələrin motivasiyasını artırır. Müsahibə videoları informatika və kompyuter bacarıqlarından istifadə ilə redaktə olunur və ingilis dili alt yazılı təqdimata hazırlanır. Dördüncü həftə Şəki talassemiya mərkəzi və qan bankındakı həkimlər ilə müzakirə üçün gün təyin olunur, hal hazırda Şəkidə məskunlaşan xəstələrin vəziyyəti ilə bağlı hazırlanmış suallara cavab alınır. Materiallar təqdimata hazırlanır. Beşinci həftə, xəstəlik səbəbli bəzən ibtidai təhsili belə natamam olan həmin xəstəlikdən əziyyət çəkən xəstələrdən bir neçəsinin evinə ekskursiya təşkil olunur. Həyat hekayələri dinlənilir və həyat hekayələrini ehtiva edən kədərli məqalələr silsiləsi ilə hər iki dildə təqdimata hazırlanır. Ziyarət zamanı dərslərdə səhhəti ilə bağlı iştirak edə bilməyən xəstələrin əksəriyyətində tikiş, toxuculuq, muncuq işləmə kimi əl sənəti bacarıqlarının olması və hazırladıqları əşyalar son təqdimat sırasında dəstək məqsədli satılaraq xəstələrə dəstək durulması ilə bağlı fikir formalaşır. Altıncı həftə, həfətələrlə əziyyət çəkilərək təqdimata hazırlanan materiallar gözdən keçirilir. Elan lövhəsinə təqdimat tarixi yazılır, talassemik xəstələrin yaxınları, bir neçə həkim və 200 dən çox akademik tələbə və müəllim heyətinin istirakı ilə təqdimat hər iki dildə təqdim olunur və hədəflənən mariflәndirmə və əl işləri sərgisinin keçirilməsi ilə başa çatır.

Həyata keçirilən proyektin müsbət tərəfləri: 1. Tələbələr arasında əməkdaşlıq gücləndi. 2. İş bölgüsünə tərəddüdsüz əməl olundu. 3. Heç bir tələbə proyektdən kənarda qalmadı. 4. Fənnlərarası inteqrasiya gücləndi. 5. Empatiya və şükranlıq hissi artdı. 6. Həkimlər və şəhər sakinləri ilə məqsədyönlü dialoqlar vətəndaşlıq hissini gücləndirdi. 7. Dil bacarıqları istər yazılı istər şifahi şəkildə materialların təqdimata hazırlanması zamanı praktiki olaraq təkmilləşdirildi. 8. Maariflәndirmə prosesi gələcəyin müəllimləri olan tələbələrə öyrətməyin və müəlimliyin əhəmiyyətini faktiki olaraq göstərdi.

Həyata keçirilən proyektin mənfi tərəfləri: 1. Akademik saatlardan əlavə proyekt işi üstündə əlavə saatlar həm tələbələrin həm də müəllimin yorğunçuluğunu artırdı. 2. Nəqliyyat vasitəsiylə məntəqələrə ziyarət xərci və istər proyektin davam etdiyi 6 həftəlik dövr, istərsə də təqdimat əsnasında istifadə olunan bütün resursların xərci həm müəllim həm də tələbələr arasında bölündü ki bu da maddi yükü artırdı. 3. Təqdimat əsnasında təskil olunan sərgidəki əl işlərinin satışından əldə

olunmuş gəlir xəstəlikdən əziyyət çəkən xəstələrə təqdim olunsa da bu satışın davamlılığı təmin oluna bilmədi.

Bir çox tədqiqatlar göstərir ki, bu modellə öyrənən tələbələrdə həmyaşıdlarına nisbətən daha çox akademik nailiyyətlər əldə edirlər. Onların akademik və sosial mənlik anlayışı daha yüksəkdir, qərar qəbul edərkən daha əxlaqi və etik olmağa meyllidirlər, başqalarına qarşı tolerantlıq və empatiya inkişaf etdirilir, cəmiyyət və icma problemlərini başa düşmələri genişlənir, idrak və problem həll etmə bacarıqları daha təkmilləşir və müsbət sosial və siyasi dəyişikliklərə təsir göstərməyə maraqları artır (Cristine, Cress, 2005: 28). Həyata keçirilən proyektin iştirakçılarının həm akademik həm sosial yöndən irəliləyişi XÖ modeli ilə bağlı təcrübi fikirlərlə səsləşir.

Akademik əsas cərəyana keçsə də, faktiki tətbiqi qeyri-müəyyən görünən, çox vaxt qısamüddətli qrantlar hesabına maliyyələşdirilən və fakültə tərəfindən "sadəcə" nəzəri (və vaxt aparan) pedaqogika kimi baxılan və ənənəvi təcrübə və təhsil üçün zərərli ola biləcək (Butin, 2006: 473) bu tədris modelinin tətbiqi zamanı müsbət və mənfi cəhətlərin nəzərə alınaraq çıxarılan nəticə onu deməyə əsas verir ki, üstünlükləri mənfi tərəflərindən ikiqat çox olan XÖ modelinin mənfi tərəfləri düşünülmüş addımlar və əməkdaşlıqlar fonunda kompensasiya oluna bilər. Ancaq bu işin son nəticəsində tələbələrin həm dərs materiallarının öz manasını həyati tətbiqlə qazanması və mənəvi dəyərləri formalaşdıran təcrübəsi heç nə ilə kompensasiya oluna bilməz və bu çətinliklər bizə əslində XÖ kimi modellərə getdikcə daha çox ehtiyac duyacağımızı göstərən səbəblərdir və "şagirdləri açıq öyrənmə situasiyaları ilə təmin etməyə kömək edir (Matthews, Zimmerman, 1999: 396).

## Nəticə

XÖ təlim modelinin məqsədi, tənqidi və yaradıcı düşüncə, refleksiya, ünsiyyət, əməkdaşlıq, informasiya savadlılığı, social bacarıqlar tipli 21-ci əsr bacarıqlarını inkişaf etdirmək və öyrənmə prosesini eksperimental öyrənmə sahələri ilə əlaqələndirmək və vətəndaş hissininin formalaşması ilə şərtləndirməkdir. Tətbiq olunan hər fonda öz üstünlükləri, mənfi tərəflərini üstülüyən XÖ modeli konkretləşmiş akademik plana uyğun tətbiq olunarsa istənilən fənn üçün planlaşdırıla bilər və məqalədə sadalanan faydalarla yanaşı əldə olunan təcrübə istənilən halda monoton nəzəri materiallara məna qazandıra bilər.

## Ədəbiyyat

1. Bringle, R.G., Hatcher, J.A. (1995). A service-learning curriculum for faculty. Michigan Journal of Community Service-Learning.
2. Kendall, J.C. (1990) 'Combining service and learning: A resource book for community and public service', Raleigh, N.C.: National Society for Experiential Learning.
3. Bringle, R.G., Hatcher, J.A., McIntosh, R.E. (2006). Analyzing Morton's Typology of Service Paradigms and Integrity. Michigan Journal of Community Service Learning.
4. Kaye, C.B. (2004). The Complete Guide to Service Learning: Proven, Practical Ways to Engage Students in Civic Responsibility, Academic Curriculum, Social Action. Free Spirit Publishing.
5. Jacoby, B. (2014). Service-learning essentials: Questions, answers, and lessons learned. San Francisco.
6. Fertman, C. (1994). Service Learning for All Students University of Pittsburgh.
7. Heyer, R. (2015). Learning through reflection: The critical role of reflection in work-based learning. Journal of work-Applied Management.
8. Freire, P. (1972). Pedagogy of the oppressed. Harmondsworth: Penguin Education Specials).
9. Aslanargun, E. (2012). Ethical responsibility of schools: an example of community service in Turkey. New Educational Review.
10. Cristine, C. (2005). Learning through Serving: A Student Guidebook for Service-Learning Across the Disciplines.

11. Butin, D. (2006). The Limits of Service-Learning in Higher Education. The Review of Higher Education, Volume 29, Number 4, Summer, pp.473-498.
12. Matthews, C., Zimmerman, B.B. (1999). Integrating Service Learning and technical communication: Benefits and challenges. Technical Communication Quarterly.

Göndərilib: 06.12.2023 Qəbul edilib: 29.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/60-66

**Şəlalə Nəbiyeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
elekberlimehemmed@mail.ru
**Təranə Əliyeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
terane.aliyeva64@bk.ru
**Amalya Rzayeva**
Azərbaycan Dövlət Aqrar Universiteti
amalya_rzayeva@mail.ru

# MƏRKƏZİ BANKIN MAKROPRİDENSAL TƏNZİMLƏNMƏ SİYASƏTİ

**Xülasə**

Məqalə Mərkəzi Bankın ölkədə maliyyə sabitliyinin təmin olunması məqsədi ilə həyata keçirdiyi makropridensal tənzimləmə siyasətinin mahiyyətinə həsr edilmişdir.

Mərkəzi Bankın pul- kredit siyasətini həyata keçirmək üçün tətbiq etdiyi alətlər və cari il üçün həyata keçirilən pul siyasətinin yekunları, pul- siyasətinin məqsəd və vəzifələri öz əksini tapmışdır. Məqalədə Mərkəzi Bankın strategiyasının müəyyən edilməsinin əsas prinsiplərindən biri pul kütləsinin artım sürətinin və milli pul vahidinin xarici valyutalara nisbətən kursunun tənzimlənməsi, cari ildə faiz dəhlizinin parametrlərinin müəyyən edilməsi, məcburi ehtiyat normalarının hesablanması və saxlanılması qaydalarına edilən dəyişikliklər öz əksini tapmışdır. Mərkəzi bankın açıq bazarda qiymətli kağızlarla həyata keçirdiyi alqı- satqı əməliyyatlarının mahiyyəti verilmişdir.

***Açar sözlər:*** *Mərkəzi Bank, pul-kredit siyasəti, açıq bazarda əməliyyatlar, məcburi ehtiyat normaları, REPO əməliyyatı, faiz dəhlizinin parametrləri*

**Shalala Nabiyeva**
Azerbaijan State Agrarian University
elekberlimehemmed@mail.ru
**Tarana Aliyeva**
Azerbaijan State Agrarian University
terane.aliyeva64@bk.ru
**Amalya Rzayeva**
Azerbaijan State Agrarian University
amalya_rzayeva@mail.ru

## Macroprudential regulatory policy of the Central Bank

**Abstract**

The article is devoted to the essence of the macroprudential regulation policy implemented by the Central Bank in order to ensure financial stability in the country.

The instruments used by the Central Bank to implement monetary and credit policy and the results of the monetary policy implemented for the current year, the goals and objectives of the monetary policy have been reflected. In the article, one of the main principles of determining the strategy of the Central Bank is reflected in the regulation of the rate of growth of the money supply and the exchange rate of the national currency unit in relation to foreign currencies, the determination of the parameters of the interest rate corridor in the current year, the changes made to the rules for calculating and maintaining mandatory reserve norms. The essence of the purchase and sale operations of the central bank with securities in the open market is given.

***Keywords:*** *Central Bank, monetary-credit policy, open market operations, mandatory reserve norms, REPO operation, interest corridor parameters*

## Giriş

2023-cü il qlobal iqtisadi proseslər fonunda Azərbaycan iqtisadiyyatında dinamik inkişaf və makroiqtisadi sabitlik davam etmişdir. Qeyri-neft sektoru iqtisadiyyatının profisiti strateji valyuta ehtiyatlarının artımını təmin etmişdir. Azərbaycan dünya ölkələri arasında makroiqtisadi sabitlik üzrə ilk onluqdakı yerini qorumuşdur. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin uğurla həyata keçirdiyi iqtisadi artım və şaxələnmə siyasətinə, strateji inkişaf prioritetlərinə uyğun olaraq Mərkəzi Bank 2023-cü ildə də ölkədə makroiqtisadi sabitliyin təmin olunmasında fəal iştirak etmişdir. Mərkəzi Bank öz fəaliyyətini inflyasiyanın aşağı təkrəqəmli səviyyədə saxlanılması, manatın məzənnəsinin və bank sektorunda maliyyə sabitliyinin qorunması, bankların iqtisadi inkişafda rolunun artırılmasına yönəltmişdir. Qlobal iqtisadi mühitdən irəli gələn risklərə baxmayaraq, bütün bu məqsədlərə nail olunmuşdur. Makroiqtisadi sabitlik qorunmuş, manat bir daha özünü sabit valyuta kimi təsdiq etmişdir (Məhərrəmov, 2015: 768).

Ölkə iqtisadiyyatının şaxələndirilməsi siyasətinə uyğun olaraq Mərkəzi Bank 2024-ci ildə makroiqtisadi və maliyyə sabitliyinin qorunmasına, bank sektorunun maliyyə dərinliyinin artırılmasına, maliyyə-bank infrastrukturunun inkişafına yönəlmiş fəaliyyətini davam etdirəcəkdir. Mərkəzi Bank pul siyasəti vasitəsilə növbəti ildə də inflyasiyanın aşağı təkrəqəmli səviyyədə saxlanılmasını hədəfləyir. Bunun üçün ilk növbədə manatın məzənnəsinin sabitliyinin qorunması mühüm vəzifələrdən biridir.

Qeyri-neft iqtisadiyyatının kreditlərə olan tələbatının effektiv ödənilməsi, maliyyə xidmətləri və resurslarının əlyetərliyinin təmin edilməsi, regionlarda müasir bankçılığın inkişafı, nağdsız ödənişlərin və elektron bankçılığın miqyasının genişləndirilməsi, ipoteka mexanizminin təkmilləşdirilməsi dövlətin bank siyasətinin növbəti ildə əsas hədəfləridir (Mişkin, 2021).

Mərkəzi Bankın Azərbaycan iqtisadiyyatının inkişafında çox böyük rolu vardır. Belə ki, Mərkəzi Bank iqtisadiyyatın inkişafının əsasını təşkil edən milli valyutanın sabitliyini təmin edir və onun alıcılıq qabiliyyətini tənzimləyir. Mərkəzi Bank normal pul-kredit siyasəti həyata keçirməklə istehsalın inkişafina təkan verə, inflyasiyanın səviyyəsini aşağı sala, işsizliyi nisbətən aradan qaldıra bilər. Bundan başqa Mərkəzi Bank respublikada pul dövriyyəsini tənzimləyir, dövriyyədəki pulların banklara cəlb edilməsini təşkil edir (3).

Azərbaycan Respublikası Mərkəzi Bankı 2023-cü ilin ötən dövründə öz mandatına uyğun funksiyalarının həyata keçirilməsini təmin etmiş, ölkədə makroiqtisadi və maliyyə sabitliyinin qorunmasına yönəldilmiş siyasət həyata keçirmişdir.

Tərəfdaş ölkələrdə inflyasiyanın azalması, dünya əmtəə bazarlarında qiymətlərin enməsi, beynəlxalq yükdaşıma xərclərinin pandemiyadan əvvəlki səviyyələrə qayıtması inflyasiyaya azaldıcı təsir etmişdir. Eyni zamanda valyuta bazarında tarazlığın qorunması, manatın nominal effektiv məzənnəsinin möhkəmlənməsi, qəbul edilmiş pul siyasəti qərarları monetar şərait vasitəsilə inflyasiya təzyiqlərini azaltmışdır. Xarici mühitin əlverişli olması, ölkənin qeyri-neft ixrac potensialının yüksəlməsi valyuta bazarında tarazlığın dəstəklənməsində xüsusi rol oynamışdır (Sultanov, Şamilzadə, 2022).

Pul bazarında əməliyyatlar üzrə orta faiz dərəcələri faiz dəhlizinin dəyişiminə reaksiya verməkdə davam etmişdir. Bunlara nail olmaq məqsədilə respublikada gələcəkdə bank sisteminin fəaliyyəti aşağıdakı istiqamətə yönəldilməlidir:

- bank sektorlarının fəaliyyətinə, beynəlxalq maliyyə təsisatları tərəfindən nəzarət edilməli və onların maliyyə bazası möhkəmləndirilməlidir;
- beynəlxalq proqramların həyata keçirilməsində respublika banklarının fəaliyyətindən və imkanlarından istifadə olunmalıdır;
- Bank sektorları respublikadan kənara irihəcmli kapital axınının qarşısını almalı və onun iqtisadi mexanizmini hazırlamalıdır;
- Respublikada bütün bankların fəaliyyətini tənzimləyən və onların işinə nəzarət edən banklararasıƏlaqələndirmə Şurası (komissiyası) yaradılmalıdır;
- Beynəlxalq və ölkədaxili kreditlərin tənzimlənməsində bank nəzarətinin rolu artırılmalıdır;
- müasir bank işini, xidmətini mənimsəyən, idarə edən təlim-tədris mərkəzləri yaradılmalıdır;

- Respublikada müasir bank infrastrukturu yaradılmalı və trast,faktorinq bank xidmətlərinin tətbiq dairəsi genişləndirilməlidir;
- Azərbaycanda normal maliyyə sabitliyini tənzimləyən və nizamlayan bank menecmenti sistemi yaradılmalıdır.
- sərt pul-kredit siyasəti yeritmək vasitəsilə inflyasiyanın monetar amillərinin təsirinin məhdudlaşdırılması vacibdir;
- qiymətlərin və milli valyutanın sabitliyinin təmin edilməsi;
- depozitlər üzrə faiz dərəcələrinin artırılması;
- əmanətlərin indeksasiya edilməsi;
- nağd və qeyri-nağd pul arasında qeyri-normal nisbətin ləğv edilməsi;
- qiymətli kağızlar bazarının formalaşması məqsədə uyğundur.

Göstərilən təkliflər gələcəkdə ölkənin milli iqtisadiyyatının inkişafına təminat verən bank sisteminin formalaşmasına və ona uyğun olan maliyyə strukturlarının qurulmasına və onların fəaliyyətini əsaslandıran, iqtisadi təhlükəsizliyə təminat verən iqtisadi siyasətin aparılmasına imkan yaradacaqdır (Əsgərova, 2009: 391).

İqtisadi inkişafın istənilən sahəsində Mərkəzi Bankın rolu çox böyükdür və ölkədə gedən iqtisadi inkişaf proseslərində birbaşa iştirak edir. Mərkəzi Bank, o cümlədən Azərbaycan Respublikası ərazisində nağd pul emissiyasını həyata keçirən yeganə kredit təşkilatıdır. Mərkəzi Bank kommersiya banklarının işinə nəzarət edir.

Beynəlxalq inteqrasiyası hər bir ölkənin Mərkəzi Bank sisteminin inkişafının strateji istiqamətlərini müəyyənləşdirir və bankların gücünün, qüdrətinin ölkə iqtisadiyyatına təsirinin nə dərəcədə əhəmiyyətli olduğunu bilavasitə təsdiq edir. Son dövrdə ölkədə baş verən sosial-iqtisadi çətinliklər bir daha təsdiq etdi ki, milli iqtisadiyyatını, real bazar strukturlarını formalaşdırmayan respublika beynəlxalq aləmdə baş verən maliyyə sarsıntılarının təsirindən qurtula bilməz. Deməli, özünün milli iqtisadiyyatmı formalaşdıran və iqtisadi təhlükəsizliyini qoruyan ölkənin müasir, güclü və normal işləyən bank sistemi olmalıdır (Məmmədov, 2010: 320).

1991-ci il 18 oktyabr tarixində Azərbaycan öz dövlət müstəqilliyini bərpa etdikdən sonra müstəqil Azərbaycan Respublikasının bank sisteminin, o cümlədən mərkəzi bankın yaradılması üçün hüquqi baza yaradıldı.

Konstitusiya Qanununa uyğun olaraq "Azərbaycan Respublikası Milli Bankının yaradılması haqqında" Azərbaycan Respublikası Prezidentinin 1992-ci il 11 fevral tarixli Fərmanı ilə Dövlət Bankının, keçmiş SSRİ Sənaye-Tikinti Bankının, SSRİ Aqrar-Sənaye Bankının Azərbaycan Respublikası bankları bazasında Azərbaycan Respublikasının Mərkəzi Bankı yaradıldı. 18 mart 2009-cu il tarixli ümumxalq referendumunun nəticəsinə əsasən bankın adı ("Azərbaycan Respublikasının Milli Bankı") dəyişdirilərək "Azərbaycan Respublikasının Mərkəzi Bankı" adlandırıldı (Azərbaycan Respublikasının Mərkəzi Bank haqqında Azərbaycan respublikasının Qanunu, 1996).

Azərbaycan Respublikası Konstitusiyasının 19-cu maddəsinin 11 hissəsinə müvafiq olaraq Mərkəzi Bankı dövlətin müstəsna mülkiyyətindədir. Mərkəzi Bankın məqsədi, funksiya və səlahiyyətləri Azərbaycan Respublikasının Konstitusiyası ilə müəyyənləşdirilir.

Mərkəzi Bankın məqsədləri aşağıda göstərilmişdir:

1. Mərkəzi Bankın fəaliyyətinin əsas məqsədi öz səlahiyyətləri daxilində qiymətlərin sabitlіyininin təmin edilməsidir.
2. Mərkəzi Bankın fəaliyyətinin məqsədi, həmçinin, bank və ödəniş sistemlərinin sabitliyini və inkişafmı təmin etməkdir.
3. Mənfəət götürmək Mərkəzi Bankın əsas məqsədi deyildir.

- dövlətin pul və valyuta siyasətini müəyyən edir və həyata keçirir;
- nağd pul dövriyyəsini təşkil edir, pul nişanlarının tədavülə buraxılmasını və tədavüldən çıxarılmasını həyata keçirir;

- sərəncamında olan beynəlxalq qızıl-valyuta ehtiyatlarını saxlayır və idarə edir (Hüseynov, 2015: 296).

Mərkəzi Bankın kapitalı onun nizamnamə kapitalından və kapital ehtiyatlarından ibarətdir və Mərkəzi Bankın nizamnamə kapitalı 500 milyon manatdır. Mərkəzi Bankın kapital ehtiyatları tədavülə buraxılmış nağd milli valyutanın **15 faizi** miqdarında müəyyən edilir və hesabat ilinin mənfəətindən ayırmalar hesabına formalaşdırılır.

Mərkəzi Bankın kredit təşkilatlarının öhdəlikləri üçün, kredit təşkilatları isə Mərkəzi Bankın öhdəlikləri üçün cavabdeh deyildir (9).

Mərkəzi Bank Azərbaycan Respublikasında bank fəaliyyətinin həyata keçirilməsi üçün kredit təşkilatlarına xüsusi icazələrin (lisenziyaların), onların filial və şöbələrinə, habelə nümayəndəlik fəaliyyətinin həyata keçirilməsi üçün yerli və xarici bankların nümayəndəliklərinə icazələrin verilməsində və onların ləğv edilməsində müstəsna səlahiyyətə malikdir (Hüseynov, 2015: 296).

*İqtisadiyyatın dövlət tənzimlənməsində Mərkəzi Bankın pul - kredit siyasəti mühüm rol oynayır. Pul - kredit siyasəti müasir dövrdə makroiqtisadi siyasətin əsas tərkib hissəsidir. Mərkəzi Bank ölkədə fəaliyyət göstərən bütün kredit təşküatlarına müxtəlif iqtisadi vasitələrlə təsir edərək pul-kredit sisteminin sabitliyinin təmin olunmasına, möhkəm və dayanıqlı maliyyə bazasına malik olan bank sisteminin formalaşmasına şərait yaradır.*

DSK-nın məlumatına əsasən 2023-cü ilin sentyabrında illik inflyasiya (2023-cü ilin sentyabr ayının 2022-ci ilin sentyabr ayına nəzərən) 5.1% təşkil etmişdir. Bu göstərici ötən ilin sentyabrında qeydə alınmış pik səviyyə ilə müqayisədə 10.5 faiz bəndi aşağıdır. Orta illik inflyasiya (2023-cü ilin yanvar-sentyabrı 2022-ci ilin yanvar-sentyabrına nəzərən) isə sentyabrda 10.9% olmuşdur. Mərkəzi Bankın son proqnozlarına görə inflyasiyanın 2023-cü ilin sonuna 4.3%, 2024-cü ildə isə 5.3% olacağı gözlənilir (Azərbaycan Respublikasının Mərkəzi Bankı, 2023).

*Azərbaycan Respublikasının Mərkəzi Bankı özünün pul - kredit siyasətini aşağıdakı vasitələrin köməyi ilə həyata keçirir:*

- *açıq bazarda əməliyyatların aparılması;*
- *faiz dərəcələrinin müəyyən edilməsi;*
- *kredit təşkilatları üçün məcburi ehtiyat normalarının müəyyən edilməsi;*
- *kredit təşkilatlarının yenidən maliyyələşdirilməsi;*
- *depozit əməliyyatlarının aparılması* (Hüseynov, Nəbiyeva, Quliyev, 2020: 304).

***Açıq bazarda əməliyyatların aparılması**: Bu siyasət Mərkəzi Banktərəfindən açıq bazarda özünün və dövlətin buraxdığı qiymətli kağızların alqı- satqısı ilə əlaqədar olan əməliyyatları, həmçinin xarici valyutanın alqı- satqısı ilə əlaqədar əməliyyatları əhatə edir.*

*Bazar iqtisadiyyatı ölkələrində pul – kredit tənzimlənməsində qiymətli kağızlar bazarı mühüm rol oynayır. Qiymətli kağızlar bazarında aparılan əməliyyatlar hesabına bir tərəfdən dövlət büdcəsinə vəsait cəlb olunur,digər tərəfdən isə Mərkəzi Bankın pul - kredit siyasətininhəyata keçirilməsində bir vasitə kimi istifadə edilir.*

*Hazırda Mərkəzi Bankın DQI (Dövlət qısamüddətli istiqrazlar) bazarında iştirakı əsasən bank sisteminin likvidliyinin qısamüddətli tənzimlənməsi məqsədini daşıyır*Mərkəzi Bank dövr ərzində müxtəlif müddətli 102 not hərracı baş tutmuşdur. Həmçinin dövr ərzində sterilizasiya məqsədli 302.5 mln. manat həcmində 7 günlük əməliyyatlar (REPO və 1 həftəlik not hərracları) keçirilmişdir (Azərbaycan Respublikasının Mərkəzi bankı maliyyə sabitliyi hesabatı, 2023).

***Faiz siyasəti**. Bu əməliyyat zamanı Mərkəzi Bank uçot dərəcəsini və özünün əməliyyatları üzrə faiz dərəcəsini müəyyən edir.*

*Başqa sözlə, Mərkəzi Bank kommersiya banklarına qısa və bəzi hallarda uzun müddətli kreditlər verə bilər. Bu* **kreditlərə overdraft, oyernayt və lombard** *kreditlərini göstərmək olar. Bu kreditlər müvəqqəti çətinliyə düşmüş banklara verilir. Overdraft kredit təminatsız kredit olub, bir ay müddətinə* limitlə verilir.*Overnaytkrediti isəkommersıya banklarına bir günlük verilən kreditlərdir. Lombard krediti isə kommersiya banklarına girov təminatı əsasında, əsasən qısamüddətli dövlət istiqraz vərəqələri və ya xəzinədarlıq veksellərini girov götürməklə bir ay müddətinə verilir.*

***Mərkəzi Bank uçot dərəcəsinin*** *müəyyən edərkən ölkədəki mövcud makroiqtisadi durumu və maliyyə bazarının vəziyyətini nəzərə alır (13).*

1. *Uçot dərəcəsi yüksəldikcə kommersiya banklarının təkrar maliyyələşməsi bahalaşır və bu, bütövlükdə kreditin dəyərinin qalxmasına səbəb olur. Yox əgər Mərkəzi Bankın məqsədi kredit təşkilatlarının kredit potensialının artırılmasıdırsa, bu halda o, uçot dərəcəsini aşağı salır.* 2023-cü ilin 9 ayında pul siyasəti adekvat monetar şərait vasitəsilə inflyasiya təzyiqlərinin məhdudlaşdırılmasına yönəldilmişdir. 2023-cü ilin yanvar-sentyabr ayları ərzində Mərkəzi Bankın İdarə Heyəti hesabat dövründə faiz dəhlizinin parametrlərini 6 dəfə müzakirə etmiş, FAİZ DƏHLİZİ 21.12.2023 tarixindən etibarən; Aşağı həddi - 6.5%; Yuxarı həddi - 9.0%; Uçot faiz dərəcəsi - 8.0% olmuşdur (Mərkəzi Bank, 2023).
2. Mənbə: AMB Hesabat dövründə pul siyasəti aləti.

*Bank kredit götürərkən Mərkəzi Banka öz adına yazılmış və əsasən qiymətli kağızlarla təmin olunmuş bank öhdəliyi verir. Kredit qaytarılanda Mərkəzi Bank müəyyən olunmuş səviyyədə faiz tutur. Kredit verməklə Mərkəzı Bank kommersiya banklarının kredit ehtiyatlarmı və kreditləşmə imkanlarmı artırmış olur. Lakin Mərkəzi Bankın verdiyi kreditlərin xüsusi çəkisi bankların kredit resurslarının ümumi həcmində o qədər də yüksək yer tutmadığına görə (hazırda 5% təşkil edir) bu amil pul təklifinin həcminə əhəmiyyətli dərəcədə təsir göstərə bilmir. Ona görə də Mərkəzi Bank bu məqsədilə açıq bazar əməliyyatlarına daha çox üstünlük verir.*

***Məcburi ehtiyat normaları****: Mərkəzi Bankın müəyyən etdiyi məcburi ehtiyatlar bankların depozit bazasının və bankların verdiyi kreditin həcminə təsir edir. Hazırda məcburi ehtiyatlara kredit təşkilatlarında daha yüksək likvidliyə malik olan aktivlər aiddir. Minimum ehtiyatlar pul siyasətinin həyata keçirilməsi alətlərindən biri kimi iki vəzifəni yerinə yetirir:*

1. *Pul bazarında likvidliyin cari tənzimlənməsinə,əmanət və depozitlər üzrə bank öhdəliklərinin təminatlılığına xidmət edir.*
2. *Kredit təşkilatlarının resurs imkanlarmı tənzimləyir* (Mərkəzi Bank, 2023).

2023-cü ilin ötən dövründə bank sistemindəki likvidliyin effektiv idarə edilməsi məqsədilə “Məcburi ehtiyatların norması, hesablanması və saxlanması Qaydası”na dəyişikliklər edilmişdir. Mərkəzi Bankın İdarə Heyətinin 03.07.2023 tarixli qərarı ilə “Məcburi ehtiyatların norması, hesablanması və saxlanması Qaydası”na edilən dəyişikliklərə əsasən milli valyutada hüquqi şəxslərin depozitlərinin məbləğinin bir milyard manatı, xarici valyutada hüquqi şəxslərin depozitlərinin məbləğinin isə yeddi yüz əlli milyon manat ekvivalentini üstələyən banklar üzrə məcburi ehtiyat normaları bütün öhdəliklər üzrə müvafiq olaraq 10% və 12% səviyyəsində müəyyən olunmuşdur. Milli valyutada hüquqi şəxslərin depozitlərinin məbləği **bir milyard manatdan, xarici valyutada hüquqi şəxslərin depozitlərinin məbləği yeddi yüz əlli milyon manat ekvivalentindən** az olan banklar üzrə isə məcburi ehtiyat normaları bütün öhdəliklər üzrə müvafiq olaraq 5% və 6% səviyyəsində saxlanılmışdır. Həmçinin “Məcburi ehtiyatların norması, hesablanması və saxlanması Qaydası” 06.07.2023-cü il tarixində qüvvəyə minən “Azərbaycan Respublikasının Mərkəzi Bankı haqqında Qanunu”na uyğunlaşdırılmışdır (13).

***Depozit siyasəti****. Mərkəzi Bankla kommersiya bankları arasında pul vəsaitlərinin hərəkətini tənzimliyir. Mərkəzi Bank depozit siyasəti vasitəsi ilə kredit təşkilatlarının ehtiyyatlarının vəziyyətinə təsir edir..*

***Valyuta siyasəti****. Ölkədə həyata keçirilən valyuta siyasətinin əsas məqsədi milli valyutanın məzənnəsinin qorunmasi, daxili valyuta bazarının dinamik inkişafının təmin edilməsi, qızıl valyuta ehtiyatlarının artırılması və s.ibarətdir.*

*Valyuta siyasətinin həyata keçirilməsininən mühüm vasitlərindən biri valyuta tənzimlənməsindən ibarətdir. Mərkəzi Bank valyuta tənzimlənməsinin əsasən iki formasından istifadə edir: diskont və deviz siyasəti.*

*Diskont siyasəti - faiz dərəcələrinin yüksəldilməsi tədiyyə balansının yaxşılaşdırılması, valyuta ehtiyatlarının qorunmasi və valyuta məzənnəsinin dəstəklənməsi məqsədi güdür.*

*Deviz siyasəti - Mərkəzi Bank tərəfindən xarici valyutanın alınıb - satılması yolu ilə milli pul vahidinin məzənnəsinə təsir etmək vasitəsidir. Belə əməliyyatlar həm də "valyuta müdaxiləsi" adlanır* (Hüseynov, Nəbiyeva, 2023: 299).

BDVB-də valyuta əməliyyatlarının həcmi 16.8 mlrd. ABŞ dolları ekvivalentində olmuşdur ki, bunun da 74%-ni ABŞ dolları ilə aparılan əməliyyatlar təşkil etmişdir. BDVB-də valyuta əməliyyatlarının 93.6%-i hüquqi şəxslərlə aparılan valyuta əməliyyatlarının payına düşmüşdür.




2023-cü ilin 9 ayında Mərkəzi Bankda ARDNF-in valyuta satışlarının həyata keçirilməsi üzrə 71 valyuta hərracı baş tutmuşdur. Hesabat dövründə valyuta hərraclarının 99%-də təklif tələbi üstələmişdir.

Dövr ərzində valyuta bazarının həm nağd, həm də nağdsız seqmentində əməliyyatların həcmi azalmışdır. 9 ayda nağdsız valyuta bazarında aparılmış əməliyyatların həcmi ötən ilin müvafiq dövrünə nəzərən 6% azalaraq 21 mlrd. ABŞ dolları ekvivalentidə 5 olmuşdur. Nağdsız valyuta əməliyyatlarının 79%-i ABŞ dollarında, 21%-i isə digər valyutalarda aparılmışdır. Valyuta əməliyyatlarının 20.1%-i banklararası valyuta bazarında (BVB), 79.9%-i isə bankdaxili valyuta bazarında (BDVB) həyata keçirilmişdir (Azərbaycan Respublikasının Mərkəzi bankı maliyyə sabitliyi hesabatı, 2023).

## Nəticə

Milli valyutanın məzənnəsini tənzimləmək məqsədi ilə Mərkəzi Bank xarici valyutanın alqı-satqısını həyata keçirir. Mərkəzi Bankın valyuta bazarında aparılan əməliyyatlar idxal və ixrac stimullaşdırılmasında özünü göstərir.

Bu siyasət ya malların ixracının stimullaşdırılmasına ya da milli yalyutanın məzənnəsinin qorunub saxlanmasın təsir edir. Hər bir ölkə uğurlu valyuta siyasəti aparmaq üçün kifayət dərəcədə valyuta ehtiyatlarına malik olmalıdır.

## Ədəbiyyat

1. Məhərrəmov, A. (2015). Müasir Bank sistemi və bankçılıq. Bakı: Təhnur nəşriyyatı-Monoqrafiya, 768 s.
2. Mişkin, S. (2021). Pul, bank və maliyyə bazarlarının iqtisadiyyatı. Bakı: TEAS Press Nəşriyyat evi.
3. https://www.cbar.az/
4. Sultanov, O. Şamilzadə, G. (2022). Bank sisteminin liberalliq səviyyəsinin ölkələrarasi müqayisəli təhlili. Journal of Baku Engineering University - economics and administration Volume 6, Number 2, pp.130-138.
5. Əsgərova, R. (2009). Pul, kredit və banklar. Bakı: Mütərcim nəşriyyatı, 391 s.
6. Məmmədov, Z. (2010). Pul, kredit və banklar. Dərslik. Bakı: Azərnəşr, 320 s.
7. Azərbaycan Respublikasının Mərkəzi Bank haqqında Azərbaycan Respublikasının Qanunu. (1996). Əlavə və dəyişiliklərlə. Bakı.
8. Hüseynov, X. (2015). Pul, kredit və banklar. Ali məktəblər üçün dərslik. Bakı: Adiloğlu, 296 s.
9. http://banco.az/az
10. Azərbaycan Respublikasının Mərkəzi Bankı. (2023). Statistik bülleten. Bakı, № 9.
11. Hüseynov, M., Nəbiyeva, Ş., Quliyev, E. (2020). Bank işi praktikum. Bakı: Esoprint nəşriyyatı, 304 s.
12. Azərbaycan Respublikasının Mərkəzi bankı maliyyə sabitliyi hesabatı. (2023). Bakı.
13. https://az.wikipedia.org
14. Mərkəzi Bank. (2023). Maliyyə sabitliyi icmalı. Bakı.
15. Hüseynov, M., Nəbiyeva, Ş. (2023). Pul və banklar praktikum. Gəncə: STAR çap evi, 299 s.

Göndərilib: 01.12.2023 Qəbul edilib: 24.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/67-72

**Aytəkin Qurbanova**
Bakı Slavyan Universiteti
qurbanovaaytekin038@gmail.com

# ƏHMƏD BƏY AĞAOĞLUNUN "TANRI DAĞINDA" BƏDİİ-FƏLSƏFİ ƏSƏRİNDƏ TÜRKÇÜLÜK, TƏSƏVVÜF VƏ ŞAMANİZM İDEYASI

**Xülasə**

XX əsr Azərbaycanının publisist, şərqşünas alim, tənqidçi, ictimai xadim, ziyalı Əhməd bəy Ağaoğlunun "Tanrı dağında" əsərində türkçülük, şamançılıq, təsəvvüf ideyalarının ifadəsinə böyük əhəmiyyət verilir. Əsər ədəbiyyat və mifologiyanın ortaq müstəvisində zəruri olan məsələləri əhatə edir. Əsərin əsas ideyası ondan ibarətdir ki, yalandan, qorxaqlıqdan, zorakılıqdan, ikiüzlülükdən, saxtakarlıqdan təmizlənmiş əsərin qəhrəmanı, ruhu və nəfsi Tanrı hüzuruna çıxmış, türk millətinin elçiləri Allah dağında and içmişlər, andın məzmununda isə türk millətinin birliyi əsas yer tutur. Qəhrəmanın yolu təsəvvüfün təriqət, həqiqət və maarifçilik mərhələlərindən keçir. Təsəvvüfdə saleh və kamil insan üçün ən mühüm vəzifələrdən biri də nəfslə vuruşmaq və onu öldürməkdir. Əsərdə şaman ideyaları şaman əfsanələrindən qidalanır, şaman Azərbaycanda, Qırğızıstanda, Qazaxıstanda, Ural-Altayda və s.-də yaşayır.Türklərin mifologiyasında universal, yarı əfsanəvi, yarıcanlı din xadimi olmaqla, Tanrı ilə İnsan arasında halqa rolunu oynayan şamanlar, melodiyalar, şeirlər bəstələyir, qəhrəmanları affekt səviyyəsinə çatdırmaq iqtidarında olan rəqslər etməklə eyni zamanda ruhları çağırır, xəstəliklərə şəfa verir, müharibə zamanı öz əllərini ruhlandırırlar. şəxsiyyətlər olduğu göstərilir. Əsərdə türk xalqının tarixi, mədəniyyətinin keçdiyi inkişaf yolu, türk xalqının gözəl təbiətinin təsviri, adət-ənənələri, qonaqpərvərliyi, türk vətənində yaşayan xalqların birlik və həmrəyliyi öz əksini tapmışdır.

***Açar sözlər:*** *türkçülük, təsəvvüf, "Tanrı dağında", şamanizm, haqq yolu, kişilik yolu*

**Aytekin Gurbanova**
Baku Slavic University
qurbanovaaytekin038@gmail.com

## The idea of turkishism, sufism and shamanism in artistic and philosophical work "On the mountain of god" by Ahmed Bey Aghaoghlu

**Abstract**

The expression of the ideas of turkism, shamanism, and sufism has a great importance in the work "On the Mountain of God" by Ahmet Bey Aghaoghlu, publicist, orientalist scientist, critic, public figure and intellectual of XX century Azerbaijan. The work covers the necessary issues on the common level of literature and mythology. The main idea of the work is that the hero of the work, his soul and self, purified from lies, cowardice, violence, hypocrisy, and fraud, appeared before God, the ambassadors of the Turkish nation swore an oath on the Mountain of God, and the unity of the Turkic nation occupies the main place in the content of the oath. The hero's path passes through the sect, truth and enlightenment stages of Sufism. In Sufism, one of the most important tasks for a righteous person and a perfect person is to fight with the soul and kill it. In the work, the shaman's ideas are fed by shamanic legends, the shaman lives in Azerbaijan, Kyrgyzstan, Kazakhstan, Ural-Altai, etc. In the mythology of the Turks, being a universal, semi-legendary, semi-life religious figure, playing the role of a link between God and Man, shamans composing melodies and poems, dancing capable of bringing heroes to the level of affect, they are at the same time summoning spirits, curing diseases, inspiring their own hands during war. are shown to be personalities. The history of the Turkic people, the development path of their culture, the

description of the beautiful nature of the Turkic people, their traditions, hospitality, the unity and solidarity of the people living in the Turkish homeland are reflected in the work.

***Keywords:*** *turkism, sufism, "On the mountain of god", shamanism, path of righteousness, path of masculinity*

## Giriş

Əhməd bəy Ağaoğlu Azərbaycan və Türkiyə ədəbi-mədəni ictimai fikir tarixinə çoxcəhətli və ensiklopedik şəxsiyyət kimi daxil olmuşdur. O, M.Ə.Sabir, Mirzə Cəlil, Ü.Hacıbəyli, M.Ə.Rəsulzadə, H.Cavid, Ə.Hüseynzadə, Ə.Topçubaşov kimi bizim dövrümüzün, bizim yüzilin ən parlaq simalarındandır (Ağaoğlu, 1930: 2). Onun Azərbaycan, türk, rus, fars, fransız dillərində yazdığı əsərlər XX əsr Azərbaycan ədəbi-bədii və ictimai-siyasi fikrinin ayrılmaz hissəsini təşkil edir. Məlumdur ki, bədii-fəlsəfi əsərlər Azərbaycan mühacirət nəsri nümunələri arasında özünəməxsus yer tutmuşdur. Mühacirət ədəbiyyatında bədii-fəlsəfi nəsr əsərlərinə Ə.Ağaoğlunun yaradıcılığında da rast gəlirik. Onun mühacirət dövrü nəsr əsərlərində əsasən problemlər ümumtürk kontekstində qoyulmuşdur və bu nəsr bütövlükdə türk tarixini, türk mifologiyasını, türk adət-ənənələrini özündə əks etdirir. Təhlillər onu deməyə əsas verir ki, onun bədii-fəlsəfi yaradıcılığında Milton, Russo, Monteskyö Lokk, Spenser kimi Qərbi Avropa klassiklərindən təsirlənməklə yanaşı, Parisdə təhsil aldığı illərdə Ernst Renan, Ceyms Darmsteter, Barbiye de Meynar, Qaston Paris, İppolit Ten və s. dostları və müəllimlərinin - Avropada elm, mədəniyyət sahəsinin tanınmış simalarının əsərlərindən bəhrələnmişdir (Akalın, 2004: 164).

Əhməd bəy Ağaoğlu "Tanrı dağında" əsərində türklərin əski yaşam tərzi və inanclarından bəhs edib və türk dünyası ilə bağlı düşüncələrini əks etdirib. O, bu əsərdə türk xalqlarının üzləşdiyi problemləri və onları doğuran obyektiv və subyektiv amilləri bədii şəkildə ifadə etmişdir. Əsər türkçülüklə yanaşı şamanlıq, təsəvvüf ideyalarının ifadəsi baxımından maraq kəsb edir və ədəbiyyat və mifologiyanın ortaq müstəvisində zəruri məsələləri özündə ehtiva edir. Qeyd edək ki, Şaman Azərbaycan, Qırğızıstan, Qazaxıstan, Ural-Altay və s. türklərinin mifologiyasında universal təbiətli, yarıməfsanəvi, yarımhəyati dini şəxsiyyətdir, Tanrı ilə İnsan arasında əlaqələndirici kimi tanınmışdır. Şamanlar melodiya və şeir qoşmuş, tamaşaçıları affekt dərəcəsinə gətirməyə qadir rəqs etməyi bacarmışlar. Mənbələrdə onların, eyni zamanda, ruhları çağıran, xəstəlikləri müalicə edən, savaş vaxtı öz elini ruhlandıran şəxsiyyətlər olduğu göstərilir. Əsər qəhrəmanın bir Şamanla "Tanrı hüzuruna getməsi və bu yolun çətinliyi" ilə başlıyır. Ancaq bu çətinliklər əsər qəhrəmanını yolundan saxlamır. Təbii ki, Tanrıya qovuşmaq asan deyil və Tanrı ilə üz-üzə dayanmaq bir Türk mental düşüncəsini özündə ehtiva edir. Yolun bələdçisi isə Şamanlar Şamanı Qaraqurumlu Göyçə Tanrı qulu, Tanrı elçisidir. Yəni, o, Tanrı ilə İnsan arasında əlaqələndirici kimi rol oynayır. Burada ilk olaraq qəhrəmanın getdiyi "yol" obrazını aydınlaşdıraq. Qeyd edək ki, insanın yol getməsi azərbaycanlı təfəkküründə adi məkani hərəkət deyil, bu ilk növbədə mənəvi yol sayılır. Yola çıxmaq yüksəlişə, kamilliyə, ucalığa doğru getmək deməkdir. Məhz buna görə yolçu ruhun xilasına, ucalığa gedən şəxs kimi ülviləşir və bu yolun asan olmadığını, insanların canlarını fəda etmələri gərəkir ki, əsərdə bunun şahidi oluruq. "Tanrı hüzuruna gedirdik. Yolumuz çətin və qorxuncdu, neçələri qafalarını və gövdələrini vermişlərdi. Məni dayanılmaz bir sevda çəkirdi. Önümdə yol göstəricim Şamanlar Şamanı Qaraqurumlu Göyçə idi (Ağaoğlu, 2007: 78).

Təsəvvüfdə də yol xüsusi mənaya malikdir. Məsələn, təsəvvüfdə əsas anlayışlardan olan "təriqət" sözü "yol" deməkdir. Qəhrəmanın yolu təsəvvüfün şəriət, təriqət, həqiqət və mərifət mərhələlərindən keçir. Sufinin də təriqətdə Allaha doğru simvolik bir yol getməsi aşağıdakı kimi qruplaşdırılır:

1. Şəriət-islamın ehkamlarının mənimsənilməsi
2. Təriqət-nəfsin ram edilməsi və dəyişdirilməsi
3. Həqiqət-həqiqi "Mənə" çatma
4. Mərifət-həqiqi idraka tam qovuşma (Cəfərli, 2000: 99).

Qeyd edək ki, "Sufizm" və ya "təsəvvüf" mahiyyət etibarilə eyni mənanı ifadə edən anlayışlardır və hər iki termindən eyni inanc sistemini ifadə etmək üçün paralel şəkildə istifadə

olunur. "Sufizm orta əsrlərdə islam aləmində geniş yayılmış dini-fəlsəfi, mistik mənəvi-əxlaqi düşüncə və davranış sistemidir" (Babayev, 2007: 8). Ərəbcə isə «parlaq», «saf», «təmiz» mənalarını verən «safa» kəlməsindən yarandığı da mülahizə edilir. Həmin fikrin tərəfdarları deyilən mənanı mənəvi-əxlaqi paklıq, daxili saflıq və Haqqa gedən yoldakı ruhi təmizlik ilə əlaqələndirirlər (Babayev, 2007: 9).

Əsərdə şamanın isti yay günündə səhra ilə yol getməsi, səhrada nə bir ağac, nə bir damla suyun olmaması, iyul günəşinin onları yandırması yolun çətinliyini bir daha sübut edir. Şamanın əlində dəf, belində tütək, əfsunlu və tilsimli parçaların bədənindən asılması şamanların musiqi, rəqs və ovsunlardan istifadə etmələrinə işarə edir. Başından uzanıb tökülən və çöhrəsini bürüyən saçları isə dağınıq təsvir edilməsində təsəvvüfün izləri var. Təsəvvüfdə saçın və günəşin simvolik mənası var ki, Yaqub Babayev yazır: "Saçın çoxluğu kəsrətə, qaralığı zərrənin və bəndənin vəhdət aləmindən ayrılıb «şəbi hicran»a, üzün gözəllliyi isə Haqqın gözəlliyinin təcəllisidir. Saç bəzən ruhların məskəni anlamında da işlədilir. Qeyd edək ki, Günəş (aftab) – həm vəhdət, birlik, həqiqət, həm də gözəllik, üz və camal rəmzidir. Tanrının camal sifətlərinin nişanəsidir (Babayev, 2007: 51).

Məlumdur ki, Türk xalqlarının tarixini, mədəniyyətinin keçib gəldiyi inkişafı öyrənmək üçün Şamanizm əsas qaynaqdır. Şamanizm din olmaqdan öncə xalqın inamıdır və Şamanizm mifik təsəvvürlərlə bağlıdır. Bu mənada şamanizm - din, şamanizm - mədəniyyət tarixi və ən dar mənada şamanizm bugünkü aşıqlıqdır. Biz qədim şamanların sonuncu nümayəndəsi və ən böyük ustası kimi Dədə Qorqudu qeyd edə bilərik. Və bu gün də müəyyən adamlara deyilən dərviş, şaman təbiəti adı da təsadüfi deyim olmadığını göstərir. Mahmud Allahmanlı yazır: "Geniş mənada şamanizm bizim fikrimizcə, türk mədəniyyətində bütöv bir mədəniyyət sistemini, dünyagörüşü əhatə edir. Dar mənada ozan-aşıq sənətinin sələfi kimi anlaşılır (Allahmanlı, 2022: 10)."

Ə.Ağaoğlunun "Tanrı dağında" əsərində biz həmçinin müxtəlif türk tayfalarının şamanları haqqında məlumat əldə edirik. Məsələn, "Hər elin şamanları başda Şamanlar şamanı olmaq üzrə ayrı bir səf təşkil edir. Odur, sarı rəngli tuğun altında Cunqariya şamanları. Bax qırmızı rəngli tuğun yanında Qırğız şamanları, o biri tərəfdə göy rəngli Orxon şamanları, daha o biri yanda yaşıl rəngli Qaşqar şamanları, onların sol tərəfində qırmızı rəngli Qobi şamanları, sağ tərəfdə pənbə rəngli Altay şamanları! Bu da bizim qara rəngli Qaraqurum şamanları!" (Ağaoğlu, 2007: 85).

Şamanlar hətta ovsunlama üsulundan da istifadə edirlər və bunu musiqi ilə həyata keçirərək şər qüvvələrə qarşı magik-mistik ritual icra etməklə yol, keçid alaraq yollarına davam edirlər. Biz əsərdə bunun şahidi oluruq. Məsələn, "Birdən-birə qarşımıza iki canavar çıxdı. Ac canavarlar qorxunc bir nərə ilə üstümüzə atılmaq üzrə idi. Mən titrəyirdim. Şaman güldü, belindəki qamışı dodaqlarına yaxınlaşdırdı. Canavarlar dayandılar və qamışın səsi yüksəldikcə, Şamanın barmaqları tütəyin dilləri üzərində oynadıqca onların gözləri süzüldü, ayaqları büküldü və birdən birə ikisi də yerə sərilərək hədsiz bir maraqla dinləməyə başladı. Şaman çala-çala yola düzəldi" (Ağaoğlu, 2007: 78).

Əsərdə Şamanla aparılan dialoqdan məlum olur ki, Tanrı yolunda çəkilən nəfəsin içdən gəlməsi, gedilən yolun saf, müqəddəs, pak olması təsəvvüfün izlərinə işarədir. Təsəvvüfdə Tanrı üçün müqəddəs, saf yola çıxanlar səyyarlar və müsafirlərdir. "Canım Şaman! Qamışda Tanrı qüvvəsi vardır! Şaman dedi. - Qamış Tanrı gölündən götürülüb. Amma iş onda deyil. İş nəfəsdədir. Nəfəs içdən gəlməli, təmiz olmalıddır. Tanrı üçün çəkilən nəfəs içdən gəlir!" (Ağaoğlu, 2007: 78). Aydındır ki, canavarların nəfəsə tab gətirməmələri, nəfəsin əslinə qayıtması, əslə qayıdan hər nəfəsin hər şeyi ram etməsi Tanrıya yaxınlaşmaqda olan insanın ruhunun saflaşmasının sübutudur. Deməli, insan ruhunun təmizlənməsi ən vacib amillərdən biridir. Təsəvvüfdə Haqq yolunun yolçusu olan sufi və aşiqə salik, səyyar və ya müsafir deyilir. «Salik» ərəbcə «yol gedən», «yolçu», «təriqət yolçusu» anlamındadır. «Səyyar» «seyr edən» (Haqqa doğru hərəkət edən, Haqqı seyr edən), «müsafir» isə «səfərə çıxan» (Haqqa doğru səfər edən) mənalarında xüsusi təsəvvüf istilahı kimi işlədilir. Bədii ədəbiyyatda bunlardan «salik» termininə daha tez-tez rast gəlirik (Babayev, 2007: 32).

Əsərdə biz Ellik ulusu adlanan ulusa rast gəlirik ki, bura Tanrının sevdiyi bir ulusdur. Ulusun atası Tanrının qulu Ellikdir. Burada əsərin qəhrəmanların Tanrının sevdiyi ulusdan xeyir-dua

almalıdırlar. Qeyd edək ki, Ə.Ağaoğlu qədim türk yasasını, əcdadımızın dünyaya yer üzündəki ahəngin qorunmasına cavabdeh olaraq gəldiyini bilən, ulusu sevmək fənnini, harmoniyanı qorumaq görəvini fəhminin parlaq qüdrəti və qələminin ecazıyla "Tanrı dağı"nda mənəvi vəzifə olaraq mənimsəyən böyük insanlarımızdan biriydi (Əhməd Ağaoğlu haqqında düşüncələr, 2021: 1).

Bundan əlavə əsərdə türk elinin adət-ənənələri və qonaqpərvərliyi də əks olunmuşdur. Məsələn, bu eldə bəmbəyaz saqqallı, uzun saçları çiyninə tökülmüş Elliyin bizi hörmətlə qarşılaması türk mental düşüncəsində qonaqpərvərliyin göstəricisidir. Qəhrəmanın ağsaqqal Elliyin xeyir-duasını alması və sonra bütün ulus xalqının dua mərasiminə başlaması ulus xalqının adət-ənənələrə birlikdə riayət etdiyini görürük. Elliyin yemək zamanı gəlincə “Qutlu od” üzərinə təzə kumıs çiləməsi və 3 dəfə “Uruy!, Uruy!, Uruy!” deməsi və bütün otaqlarda oturanların hamısı bu səsləri təkrar etmələri, otağın ortasında bir bez ətrafında oturmaları, yeməkdən sonra yenə od üzərinə kumıs səpilməsi, bilməcə müsabiqəsinin keçirilməsi kimi nümunələr adət-ənənələrin sübutu və birliyin göstəricisidir. Urasay yurdunda qadınların yun yumaqlar hazırlamaları, quş tüklərindən istifadə etmələri əsas məşğuliyyətlərindən biri kimi hesab olunurdu.

Ellik əlində südlə dolu qaşıq tutaraq duaya başlaması türk yurdunda yaşayanların birliyinin, həmrəyliyinin nişanəsidir və dua vasitəsilə Tanrıdan himayə olunmalarını istəyirlər. “Bizi yaradan yiyəmiz Tanrı! Bizi saxlayan sahibimiz ana! Ey Tanrı! Ey səkkiz göyü yaradan! Ey dörd göyün sahibi ana! Ey doqquz günəşli yer! Bəslədiyimiz heyvanları qoru! Doğurduğumuz çocuqları yataqlarla bəslə!” (Ağaoğlu, 2007: 80).

Qeyd edək ki, Şaman təsəvvürləri, şaman əfsanələrindən qidalanmışdır. Bunu Şaman əfsanələrindən şaman olacaq adamı albıslar əmizdirməsi ilə qeyd edə bilərik. Bu əmizdirmə ritual-mifoloji səciyyə daşıyır. Bununla şaman yeni status qazanaraq, ruhlarla əlaqə yaradır. Ancaq, ağsaqqal Elliyin əlində süd tutmaqla duaya başlaması şamanizmin izlərini göstərməklə yanaşı, adi insanların yeni status qazanaraq yeni mərhələyə qədəm qoyması, onun Tanrı hüzuruna gedəcək yolda mərhələlərdən pillə-pillə keçməsinin göstəricisidir. “Ellik duanı bitirər-bitirməz əlindəki kumıs dolu kasanı havaya atdı. Birdən nə görsək yaxşıdır? Üç bəyaz leylək uça-uça bizə doğru gəldilər. Elliyin başı üzərində dolandılar və gön çanağın kənarına düzülərək kumıs içməyə başladılar. Bu, duanın qəbulu əlaməti idi. Ellik məmnun oldu, quşları oxşadı. Bizi kumıs içməyə dəvət etdi (Ağaoğlu, 2007: 81).”

Elliyin xeyir-duasını aldıqdan sonra qəhrəmanın Tanrı hüzuruna çıxdığı yola davam edərkən qarşısına bir çay çıxması yeni bir mərhələdən keçməsinə işarə edilir. Çay, dağ, ağac və s. kimi şeylərin Şaman inamlarında ruhları olduğu qeyd olunur. Bu da animizm ilə bağlı məsələdir ki, qədim əcdadların bütün varlıqların arxasında ruh görmək xüsusiyyətini təcəssüm etdirir. Çayın suyunun çox parlaq təsvir olunmasını Şaman Tanrı suyu olduğunu və yeddi belə çay keçməklə Tanrı dağına yaxınlaşacağını bildirir. Çaydan keçməkdə əsas şərt insanın mənən saflaşmasıdır. Belə ki, çay bu baxımdan çətin maneə-keçidlərdən biridir. Çay məkanları, dünyaları bir-birindən ayıran sərhəddir (Rzasoy, 2015: 181).

Təbii ki, qəhrəmanın mənən, ruhən təmizlənməsi vacibdir. Məlumdur ki, mömin bəndələr də su ilə dəstəmaz alaraq pak, təmiz şəkildə Tanrı hüzuruna çıxırlar. Təbii ki, İnsan ruhunun, nəfsinin saflaşlaşması və mənən Tanrıya yaxınlaşması əsərdə mühüm əhəmiyyət kəsb edən məsələlərdən biridir. Nəfs ruhla bədən arasındakı ziddiyyətin başlıca səbəbidir. Təsəvvüfdə Haqq yolçusu və kamil insan üçün ən başlıca vəzifələrdən biri nəfslə mücadilə və onun öldürülməsi sayılır. Çünki, nəfs qəlb ilə Haqq arasındakı hicabdır (Nəhəng fikir və əməl adamlarımızdan biri – Əhməd bəy Ağaoğlu: metodik vəsait, 2019: 35).

Əsərdə qəhrəmanın çayda çimərkən suyun rənginin bulanması, xoşagəlməz qoxunun gəlməsini Şaman insan ruhunun kirli olması ilə əlaqələndir. Müəllif ruh kirinin vücud kirindən dəhşətli olması havanı zəhərləsə də, sonunda insanın mənən təmizlənəcəyini və insan ruhunun pisliklərdən, yalançılıqdan, qorxaqlıqdan, zorakılıqdan, ikiüzlülükdən, fırıldaqçılıqdan paklaşmasını ancaq Tanrı çaylarında çimməklə bitəcəyini bildirir.

“Canım Şaman, ruh pislikləri nə olan şeydir?

İnsan ruhu gül yarpağına bənzər. O yaşıllanıb böyüdükcə, üzərinə bir cür böcəklər qonur. Bağban vaxtında xəbər tutmasa, yarpaq məhv olur. İnsan ruhunun böcəkləri bunlardır: yalan, qorxaqlıq, zorakılıq, ikiüzlülük, fırıldaqçılıq və s. Bu həşəratı daşıyan insanlarda artıq insanlıq qalmır və onlar Tanrı hüzuruna çıxa bilməzlər" (Ağaoğlu, 2007: 84).

Ə.Ağaoğlu əsərdə oğlanlarla qızlar arasında aparılan bir bilməcə yarışmasında Türk yurdunun sənədlərinin Bozqır düzənində oturan türklərin yurdu Şimal dənizi, Batı dənizi, Cənub dənizini əhatə etdiyini diqqətimizə çatdırmışdır.

Bozqur dənizində oturan,
Şimal dənizində bağlanan,
Yanları batı dənizinə varan,
Ətəkləri cənub dənizinə çarpan
İşığı Kil dağı,
Üzü orta yayla,
Köksü oddan günəş-
Biliniz, baxalım, bu nədir?

Oğlanlar dərhal:

- Türk yurdu, Türk yurdu!- deyə bağırışdılar (Ağaoğlu, 2007: 82).

Ə.Ağaoğlu hətta "Sərbəst insanlar ölkəsində" fəlsəfi povestində türkün tarixi keçmişinə nəzər salmışdır. "Daşqın bir qanın həmlələri ilə" Şərqə, Qərbə, Şimala və Cənuba yayılmış əcdadlarının məmləkətlər basdığından, dövlətlər qurduğundan, mədəniyyətlər meydana gətirdiyindən bəhs edir (Şamıoğlu, 2023: 42).

Əsərdə Kişilik yolunun Tanrı zirvəsinə qaldırılması Türk millətinin Tanrıya yaxınlaşmaq ideyasını əks etdirir. Kişilik əyilməzlilik, dəyanətlilik, haqq yolunun yolçusu, hürriyyət və istiqlal zirvəsinin qoruyucusu, hər kəsin yardımçısı kimi qiymətləndirilir. "Kişi Tanrı eşidir. O, Tanrı kimi əyilməz, bükülməz, öz içindən başqa kimsədən çəkinməz. O, Tanrı kimi dəyanətlidir. Varlığa, yoxluğa, aclığa, toxluğa, ucalığa, zənginliyə, yoxsulluğa baxmaz! O, Tanrı kimi haqq yolunun, insanlıq cığırının, şərəf və heysiyyət izinin, hürriyyət və istiqlal zirvəsinin qoruyucusudur. Tanrı kimi o da binəsiblərin yardımçısıdır! Tanrı kimi o da ötkəm sözlü, açıq danışandır, yalan bilməz, riya sevməz, yaltaqlıq etməz. Qısası, o mənim kainatdakı eşqimdir! Mən onda yaşayıram, onda görürəm" (Ağaoğlu, 1930: 71).

Sonda əsər Türk elinin elçilərinin Tanrı Dağında and içmələri ilə bitir ki, Andın məzmununda Türk elinin birliyi əsas yer tutur ki, bu da əsərin əsas ideyasını təşkil edir. Məlumdur ki, Türklərdə dağ ucalıq rəmzi kimi xatırlanmışdır. Həmişə də ona can atılmışdır. Eyni zamanda, bu ucalıqda bir təmizlik, təravət aranmış və Allaha yaxınlıq hiss olunmuşdur. Həmçinin, Şamanlarda andın dağ başında içilməsi bu törənlərdə çox əski türk inanıcları yer almaqdadır. Bu bir tərəfdən törənlərin dağ üzərində yapılması uca dağların tanrıya ən yaxın yerlər olmasından irəli gəlirsə, digər tərəfdən isə dağda həmişə ululuq, allaha yaxınlıq hiss olunmuşdur. Məhz ona görə də, andiçmə məqamlarında, eləcə də, daha başqa vəziyyətlərdə həmişə dağa pənah gətirilmişdir. Türk elinin elçiləri and içir: "Əlimiz var-işləyəcək, ayağımız var -gedəcək! Beynimiz var-düşünəcək, könlümüz var-duyacaq! Bir-birimizə sarılacağız. Yürüyəcəyiz! Başımız dik, ürəyimiz açıq, sözümüz ötkəm-yürüyəcəyiz! Heç bir əngəl bizi durdurmayacaq! Sönmüş ocaqlarımızı işıqlandırmaq, dağılmış yurdumuzu qurmaq üçün yürüyəcəyiz!"

## Nəticə

Qeyd edim ki, biz Ə.Ağaoğlunu Azərbaycanda çalışdığı qəzetlərdə Türk xalqları birliyinə nail olmağa cəhd göstərməklə yanaşı, Türkiyədə bir sıra dərnəklərdə də onun fəaliyyətini də görürük. Gülsərən Akalın yazır: "Əhməd bəy Ağaoğlu Türk Yurdu, Türk Ocağı, Türk Bilgi dərnəklərinin və Türk Yurdu dərgisinin qurucularındandır, həm də bu dərginin yazarlarından olmuşdur (Şamıoğlu, 2023: 70). Haqlı olaraq M.K.Atatürk demişdir: "O bütün türk dünyasının oğlu idi... Bir millət, vətən

həyatda var olduqca Əhməd bəy Ağaoğlunun adı uca tutulacaq, Türk-İslam dünyası onu böyük ehtiramla, qədirbilənliklə yad edəcək, yaradıcılığı yeni-yeni incəliklərlə işıqlandırılacaq" (Əhməd Ağaoğlu haqqında düşüncələr, 2021: 11). Bədirxan Əhmədli yazır ki, "Ankarada Ə.Ağaoğlu bir müddət Mətbuatın baş müdiri, Anadolu Agentliyində işləyir, Türkiyə Böyük Millət Məclisinə Qarsdan millət vəkili seçilir. 20-30-cu illər Türkiyə Cümhuriyyətinin qurulmasında onun da böyük əməyi olmuşdur. Ankara və İstanbul Universitetlərində professor vəzifəsində də işləmişdir" (Əhmədli, 2017: 205). Ə.Ağaoğlunun təfəkküründə Türklük və Türkçülük bir millətin oyanışı kimi təzahür edib. O, bir Türk milliyətçisidir. Türkçülük onun təfəkkürünün onurğa sütunudur (Türk Dünyasının Möhtəşəm İctimai və Siyasi Xadimi Əhməd Ağaoğlu anadan olmasının 150-ci il dönümündə simpozium, 2019: 43). Türklük və Türkçülüyü birləşdirici ünsür kimi istifadə edən ilk insanlardan biri olmuşdur və onun "Tanrı dağında" əsərində qaldırılan Türk elinin birliyi, həmrəyliyi hal-hazırda da müasir dövrümüzdə aktualdır və mühüm əhəmiyyət kəsb edən əsas məsələlərdəndir.

## Ədəbiyyat

1. Akalın, G. (2004). Türk düşüncə və siyasi həyatında Əhməd Ağaoğlu. Bakı: AzAtaM, 164 s.
2. Ağaoğlu, Ə. (2007). Seçilmiş əsərləri. Bakı: "Şərq-Qərb", 391 s.
3. Cəfərli, M. (2000). Azərbaycan məhəbbət dastanlarının poetikası. Bakı: "Elm", 265 s.
4. Babayev, Y. (2007). Təriqət ədəbiyyatı: sufizm, hürufizm. Ali məktəblərin filoloji fakültələri üçün dərs vəsaiti. Bakı: "Nurlan", 128 s.
5. Allahmanlı, M. (2022). Şaman, ozan və aşıq. Bakı: "Ağrıdağ" nəşriyyatı, 332 s.
6. Əhməd Ağaoğlu haqqında düşüncələr. (2021). Ədəbiyyat qəzeti. 30 oktyabr. № 43, s.4-5.
7. Rzasoy, S. (2015). Azərbaycan dastanlarında şaman qəhrəman arxetipi. Bakı: Elm və təhsil, 436 s.
8. Nəhəng fikir və əməl adamlarımızdan biri – Əhməd bəy Ağaoğlu: metodik vəsait. (2019). Azərbaycan Respublikası Mədəniyyət Nazirliyi. Bakı: F.Köçərli ad. Respublika Uşaq Kitabxanası, 35 s.
9. Ağaoğlu, Ə. (1930). Sərbəst insanlar ölkəsində. İstanbul: İlk nəşr, 71 s.
10. Şamıoğlu, Ş. (2023). Azərbaycan Mühacirət irsi: nəsr və ədəbiyyatşünaslıq. Bakı: "Elm və təhsil", 328 s.
11. Əhmədli, B. (2017). Azərbaycan mühacirət ədəbiyyatı: Təşəkkülü, problemləri, şəxsiyyətləri. Bakı: "Elm və təhsil", 376 s.
12. Türk Dünyasının Möhtəşəm İctimai və Siyasi Xadimi Əhməd Ağaoğlu anadan olmasının 150-ci il dönümündə simpozium. (2019). Türk Ocak Yayınları, 19-20 Sentyabr. Bakı-Azərbaycan. 21-22 oktyabr. İstanbul Türkiyə.

Göndərilib: 18.11.2023 Qəbul edilib: 20.01.2024

DOI: https://doi.org/10.36719/2663-4619/99/73-80

**Günay Gülməmmədova**
Bakı Dövlət Universiteti
magistrant
gunaygulmammadova7@gmail.com

# CƏNUBİ QAFQAZDA MÖVCUD OLAN ENERJİ LAYİHƏLƏRİ VƏ ONLARIN GEOSİYASİ ƏHƏMİYYƏTİ

**Xülasə**

Cənubi Qafqaz regionunda Avropa və Asiyanın qovşağında yerləşən Azərbaycan mühüm geosiyasi təsirlərə malik transformativ layihələrə rəhbərlik edərək qlobal enerji landşaftında əsas oyunçu kimi formalaşıb və bu təşəbbüslər arasında Avropanın enerji mənbələrinin şaxələndirilməsinə və onun Rusiya qazından asılılığının azaldılmasına yönəlmiş nəhəng infrastruktur cəhdi olan Cənub Qaz Dəhlizi (CQD) əsas təşəbbüsdür. Xəzər dənizindəki Şahdəniz qaz yatağı ilə lövbər salan SGC Cənubi Qafqaz Boru Kəmərini, Trans Anadolu Boru Kəmərini və Trans Adriatik Boru Kəmərini özündə birləşdirir. Bu mürəkkəb şəbəkə nəinki Azərbaycan təbii qazının Avropa bazarlarına nəqlini asanlaşdırır, həm də enerji təhlükəsizliyinin gücləndirilməsi və regional əməkdaşlığın gücləndirilməsi istiqamətində daha geniş səylərdə dayaq rolunu oynayır. Özünü etibarlı enerji təchizatçısı kimi yerləşdirməklə Azərbaycan öz geosiyasi mövqeyini gücləndirməyə və iqtisadi tərəfdaşlıqları gücləndirməyə çalışır, nəticədə Cənubi Qafqazın və onun hüdudlarından kənarda sabitliyə və çiçəklənməyə töhfə verir.

Bu araşdırmanın məqsədi Cənubi Qafqaz regionunda mövcud enerji layihələrini təhlil etmək və onların geosiyasi əhəmiyyətini aydınlaşdırmaqdır və ədəbiyyat icmalı, nümunə araşdırmaları və maraqlı tərəflərlə müsahibələrin birləşməsini əhatə edən hərtərəfli tədqiqat metodologiyasından istifadə etməklə, tədqiqat regionda Bakı-Tbilisi-Ceyhan (BTC) nefti kimi enerji təşəbbüslərinin cari vəziyyətini, problemlərini və perspektivlərini qiymətləndirir. boru kəməri və Cənub Qaz Dəhlizi (CQD). Nəticələr enerji təchizatı marşrutlarının şaxələndirilməsi, regional əməkdaşlığın genişləndirilməsi və əsas aktorların strateji maraqlarına təsir etməklə bu layihələrin geosiyasi dinamikanın formalaşmasında oynadığı əsas rolu vurğulayır və tədqiqat Cənubi Qafqazda enerji infrastrukturunun iqtisadi inkişafın əsas hərəkətverici qüvvəsi və geniş Avrasiya kontekstində geosiyasi dəyişikliklərin katalizatoru kimi əhəmiyyətini vurğulayır.

***Açar sözlər:*** *Cənub Qaz Dəhlizi, Azərbaycan enerji diplomatiyası, qaz ehtiyatları, Avropa enerji diversifikasiyası, enerji marşrutlarının əhəmiyyəti*

**Gunay Gulmammadova**
Baku State University
master student
gunaygulmammadova7@gmail.com

## Energy projects existing in the South Caucasus and their geopolitical significance

**Abstract**

Located in the South Caucasus region at the crossroads of Europe and Asia, Azerbaijan has emerged as a key player in the global energy landscape by leading transformative projects with significant geopolitical implications, chief among these initiatives being the Southern Gas Corridor (SGC), a massive infrastructure effort aimed at diversifying Europe's energy sources and reducing its dependence on Russian gas is an initiative. Anchored by the Shah Deniz gas field in the Caspian Sea, SGC includes the South Caucasus Pipeline, the Trans Anatolian Pipeline and the Trans Adriatic Pipeline. This complex network not only facilitates the transportation of Azerbaijani natural gas to European markets, but also serves as a support for broader efforts to strengthen

energy security and regional cooperation. By positioning itself as a reliable energy supplier, Azerbaijan seeks to strengthen its geopolitical position and strengthen economic partnerships, ultimately contributing to stability and prosperity in the South Caucasus and beyond.

The purpose of this study is to analyze existing energy projects in the South Caucasus region and clarify their geopolitical significance, and by using a comprehensive research methodology that includes a combination of literature review, case studies, and stakeholder interviews, the current status of energy initiatives such as Baku-Tbilisi-Ceyhan (BTC) oil in the study region. evaluates its situation, problems and prospects. pipeline and Southern Gas Corridor (SGC). The results highlight the key role these projects play in shaping geopolitical dynamics by diversifying energy supply routes, expanding regional cooperation, and influencing the strategic interests of key actors, and the study underscores the importance of energy infrastructure in the South Caucasus as a key driver of economic development and a catalyst for geopolitical change in the broader Eurasian context.

***Keywords:*** *Southern Gas Corridor, Azerbaijan energy diplomacy, gas reserves, European energy diversification, importance of energy routes*

## Giriş

Cənubi Qafqazda enerji infrastrukturunun inkişafı regionun iqtisadi inkişafının və geosiyasi əhəmiyyətinin əsas aspekti olmuşdur. Son bir neçə onillikdə Azərbaycan, Gürcüstan və Ermənistan kimi ölkələr enerji ilə bağlı obyektlərin tikintisinə və genişləndirilməsinə, boru kəmərlərinin, elektrik stansiyalarının və ötürücü xətlərin mürəkkəb şəbəkəsinin yaradılmasına əhəmiyyətli dərəcədə sərmayə qoyublar.

Əsas layihələrdən biri Avropanın qaz təchizatının şaxələndirilməsinə və Rusiya qazından asılılığın azaldılmasına yönəlmiş monumental təşəbbüs olan Cənub Qaz Dəhlizidir (SGC). Bu dəhliz Xəzər dənizindən təbii qazın Avropaya nəqlini təmin edən Trans-Anadolu Boru Kəməri (TANAP) və Trans-Adriatik Boru Kəməri (TAP) daxil olmaqla, bir-biri ilə əlaqəli bir neçə boru kəmərindən ibarətdir. Bu boru kəmərlərinin inkişafı Cənubi Qafqazda enerji təhlükəsizliyini gücləndirməklə yanaşı, həm də region və Avropa ölkələri arasında iqtisadi əlaqələri gücləndirib (1).

Bakı-Tbilisi-Ceyhan (BTC) boru kəməri və Cənubi Qafqaz Boru Kəməri (CQBK) regionun enerji infrastrukturunun tərkib hissəsidir. BTC boru kəməri xam neftin Xəzər dənizindən Aralıq dənizinə nəqlini asanlaşdırır və ənənəvi qaynar nöqtələrdən yan keçən strateji marşrut təmin edir. Eyni zamanda, CQBK təbii qazı Azərbaycandan Türkiyəyə və daha sonra Avropaya nəql etməklə həm istehsalçı, həm də istehlakçı ölkələr üçün enerji mənbələrinin şaxələndirilməsinə töhfə verir.

Cənubi Qafqazda enerji infrastrukturunun genişləndirilməsi ənənəvi qalıq yanacaqlarla məhdudlaşmır. Region su elektrik, külək və günəş enerjisi də daxil olmaqla bərpa olunan enerji mənbələrinin inkişafını fəal şəkildə davam etdirir. Gürcüstan kimi ölkələr daha davamlı və şaxələndirilmiş enerji qarışığına töhfə verərək, bol su ehtiyatlarını hidroenergetika üçün istifadə etməyə sərmayə qoyublar. Bərpa olunan enerjiyə doğru bu addım qlobal tendensiyalara uyğun gəlir və regionun qalıq yanacaq bazarlarında baş verən dalğalanmalara qarşı dayanıqlığını artırır.

Cənubi Qafqazda enerji infrastrukturunun inkişafı regional əməkdaşlıqla sıx bağlıdır. Azərbaycan, Gürcüstan və Türkiyə arasında üçtərəfli tərəfdaşlıq kimi region ölkələri arasında əməkdaşlıq səyləri transsərhəd layihələrin uğurla həyata keçirilməsinə şərait yaradıb. Bu təşəbbüslər təkcə enerji təhlükəsizliyini gücləndirmir, həm də Cənubi Qafqazda iqtisadi inteqrasiyanı və siyasi sabitliyi təşviq edir.

Azərbaycan Respublikası Heydər Əliyevin uzaqgörən rəhbərliyi ilə çoxvektorlu xarici siyasətin əsasını qoydu və bu siyasət xalqın beynəlxalq aləmdə nüfuzunun möhkəmlənməsində mühüm rol oynadı. Çevik ittifaqlarla səciyyələnən bu strateji yanaşma Azərbaycanın Cənubi Qafqazda mövqeyini gücləndirməklə yanaşı, həm də resursları dövlət müstəqilliyinin möhkəmləndirilməsinə və yeni potensialların açılmasına səmərəli şəkildə yönəltdi. Prezident İlham Əliyev sələfinin irsini davam etdirərək Avropa İttifaqı (Aİ) ilə milli maraqlara uyğun bərabərhüquqlu və qarşılıqlı faydalı münasibətləri gücləndirən xarici siyasət strategiyasını məharətlə həyata keçirmişdir (Adıgözəlov, 2021: 3-4).

İkinci Qarabağ müharibəsindəki son uğur regionun geosiyasi mənzərəsini əsaslı şəkildə yenidən formalaşdıraraq Azərbaycana regional əməkdaşlıq üçün yeni imkanlar və yeni inkişaf dövrünə yol açdı. Prezident Əliyev bu dəyişiklikləri düzgün qəbul edir və bildirir ki, "İkinci Qarabağ müharibəsinin nəticələri region üçün yeni reallıqlar yaradıb". Uzunmüddətli sülh üçün mühüm şərtlərin yaranması Azərbaycanın regional təsir imkanlarını artırmaqla yanaşı, Aİ ilə əməkdaşlığın genişləndirilməsi üçün imkanlar açıb.

Azərbaycanın Aİ ilə möhkəm əlaqələri müxtəlif sektorları, o cümlədən enerji, investisiya və ticarəti əhatə edir və beynəlxalq təşkilatı ölkənin əsas ticarət tərəfdaşlarından biri kimi qeyd edir. Avropa bazarlarına etibarlı xam neft tədarükçüsü kimi Azərbaycan yaxın gələcəkdə Aİ üzv dövlətlərinə təbii qaz tədarük etməyi planlaşdıraraq öz rolunu daha da artırmağa hazırdır. Bu enerji tərəfdaşlığı təkcə Azərbaycanın iqtisadi gücünü gücləndirmir, həm də Aİ-nin enerji təhlükəsizliyinə töhfə verir, iki qurum arasında simbiotik əlaqələri gücləndirir. Müxtəlif birgə proqram və layihələrin uğurla həyata keçirilməsi Azərbaycan-Avropa İttifaqı tərəfdaşlığının dərinliyini və möhkəmliyini vurğulayır. Enerji sahəsində əməkdaşlıqdan tutmuş birgə sərmayələrə və ticarət təşəbbüslərinə qədər bu müəssisələr ortaq tərəqqi və inkişafa qarşılıqlı sadiqliyi nümayiş etdirir. Azərbaycanın milli maraqları ilə Aİ-nin məqsədləri arasında strateji uyğunluq bu çiçəklənən münasibətlərin təməl daşına çevrilib (3).

Heydər Əliyev kimi liderlər tərəfindən seçilən və Prezident İlham Əliyev tərəfindən davam etdirilən Azərbaycanın çoxvektorlu xarici siyasəti diplomatik ustalıqla özünü sübut etdi. Beynəlxalq əlaqələri məharətlə idarə etməklə və Aİ kimi qurumlarla tərəfdaşlığa üstünlük verməklə Azərbaycan təkcə öz maraqlarını təmin etmir, həm də regional sabitliyə və qlobal əməkdaşlığa fəal töhfə verir. Millət bu strateji diplomatiya yolu ilə getməyə davam etdikcə, Avropa İttifaqı ilə genişlənmiş əməkdaşlıq və ortaq rifah perspektivləri ümidverici olaraq qalır.

Avropa İttifaqının Şərq Tərəfdaşlığı ölkələri ilə münasibətlərində suverenlik və ərazi bütövlüyü əsas prinsiplər kimi dayanır və Azərbaycan bu prinsiplərin davamlı müdafiəçisi olub. Azərbaycan və Aİ arasında 2018-ci il "Tərəfdaşlıq Prioritetləri" sənədində müstəqillik, suverenlik, ərazi bütövlüyü və beynəlxalq səviyyədə tanınmış sərhədlərin toxunulmazlığına sadiqlik vurğulanıb. Azərbaycan Prezidentinin köməkçisi Hikmət Hacıyev Aİ-nin Azərbaycanın ərazi bütövlüyünə tarixi dəstəyini vurğulayaraq, bu dəstəyin bariz təzahürü kimi Brüssel Sammitini və "Tərəfdaşlıq Prioritetləri" sənədini göstərib. Azərbaycanın bu prinsiplərə sadiqliyi onun Şərq Tərəfdaşlığı sammitlərindəki qəti mövqeyində özünü büruzə verir. 2020-ci il iyunun 18-də, 44 günlük Vətən Müharibəsindən bir qədər əvvəl keçirilən sammit Azərbaycanın sarsılmaz mövqeyini nümayiş etdirdi. Azərbaycan Aİ-nin bir çox üzv dövlətləri ilə sıx əməkdaşlıq edən fəal tərəfdaş ölkə olmasına baxmayaraq, öz ərazi bütövlüyünü müdafiə etməkdə qətiyyətli olmuşdur. Aİ ilə yeni tərəfdaşlıq sazişinin imzalanması üçün aparılan danışıqlar xüsusi vurğulanıb ki, bu da əlaqələrin dərinliyini və tərəfdaşlıqda əldə edilən irəliləyişi göstərir.

Prezident İlham Əliyev sammitdəki çıxışında Qarabağ probleminin sülh yolu ilə həlli üçün yekun xəbərdarlıqlar edib. O, BMT Təhlükəsizlik Şurasının qətnamələrinə və beynəlxalq sənədlərə əməl etməyin vacibliyini vurğulayaraq, Azərbaycanın diplomatik qətnaməyə sadiqliyini vurğulayıb. Bununla belə, o, Ermənistanın işğal etdiyi ərazilərdə qeyri-qanuni məskunlaşma siyasətinə də toxunub, Qarabağı Azərbaycanın ayrılmaz hissəsi kimi təsdiqləyib. Bu çıxış sadəcə diplomatik bəyanat deyil, Avropa tribunasından Ermənistana son xatırlatma idi və uzun müddətdir davam edən münaqişənin həllinin aktuallığını vurğulayırdı.

**Enerji mənbələrinin şaxələndirilməsi.**

Cənubi Qafqazda enerji mənbələrinin şaxələndirilməsi davamlı və müxtəlif enerji portfellərinə qlobal keçidi əks etdirən region ölkələri üçün strateji imperativ kimi ortaya çıxdı. Ənənəvi olaraq qalıq yanacaqlardan asılı olan Azərbaycan, Gürcüstan və Ermənistan kimi dövlətlər enerji təhlükəsizliyini artırmaq və ətraf mühitə təsirləri azaltmaq üçün getdikcə daha çox alternativ mənbələrə sərmayə qoyurlar. Bu diversifikasiya təkcə qlobal enerji bazarlarının dəyişkənliyinə cavab deyil, həm də iqlim dəyişikliyini yumşaltmaq üçün beynəlxalq səylərə uyğundur (4).

Su elektrik enerjisi Cənubi Qafqazda enerji mənbələrinin şaxələndirilməsinə mühüm töhfə verən kimi seçilir. Bol su ehtiyatlarına malik olan Gürcüstan kimi ölkələr elektrik enerjisi istehsal etmək üçün çayların gücündən istifadə ediblər. Hidroenergetika layihələri təkcə bərpa olunan və etibarlı enerji mənbəyi təmin etmir, həm də qlobal davamlılıq məqsədlərinə uyğun olaraq istixana qazları emissiyalarının azaldılmasına töhfə verir.

Bölgədə külək və günəş enerjisi getdikcə daha da şaxələndirilir. Cənubi Qafqaz ölkələri sərəncamında olan zəngin təbii ehtiyatlardan istifadə etmək üçün külək stansiyalarına və günəş parklarına sərmayə qoyurlar. Bu bərpa olunan mənbələr həm ekoloji problemləri, həm də enerji təhlükəsizliyi ehtiyacını həll etməklə ənənəvi qalıq yanacaqlara təmiz və davamlı alternativ təqdim edir.

Yerli bərpa olunan mənbələrin inkişafı ilə yanaşı, Cənubi Qafqaz enerji mənbələrinin şaxələndirilməsini asanlaşdırmaq üçün regional əməkdaşlıqda fəal iştirak edir. Bir-birini birləşdirən elektrik şəbəkələrinin tikintisi kimi transsərhəd layihələr bərpa olunan enerji resurslarının ölkələr arasında bölüşdürülməsinə imkan verir. Bu əməkdaşlıq enerji təhlükəsizliyini artırır və regiondakı ölkələr arasında iqtisadi inteqrasiyanı gücləndirir.

Cənubi Qafqazda enerji mənbələrinin şaxələndirilməsinin geosiyasi nəticələri dərindir. Bu ölkələr spesifik enerji təchizatçılarından asılılığını azaltdıqca qlobal enerji bazarlarında daha çox çeviklik və sövdələşmə gücü əldə edirlər. Bu dəyişiklik həm də xarici təzyiqlərə və geosiyasi gərginliyə qarşı həssaslığı minimuma endirərək davamlı iqtisadi inkişaf üçün daha möhkəm zəmin yaradır.

Bununla belə, şaxələndirmə prosesini çətinliklər müşayiət edir. Bərpa olunan enerji mənbələrinin fasiləli təbiəti sabit və davamlı enerji təchizatını təmin etmək üçün enerji saxlama texnologiyasında irəliləyişləri tələb edir. Bundan əlavə, ənənəvi qalıq yanacaqlardan keçid qurulmuş sənayelərin müqaviməti ilə üzləşə bilər və yerli icmalara sosial-iqtisadi təsirin idarə edilməsi üçün diqqətli planlaşdırma tələb edir.

**Regional Enerji Əməkdaşlığı.**

Cənubi Qafqazda Regional Enerji Əməkdaşlığı iqtisadi inkişafın təşviqi, enerji təhlükəsizliyinin artırılması və region ölkələri arasında diplomatik əlaqələrin qurulması üçün təməl daşı kimi meydana çıxıb. Əməkdaşlıq ilk növbədə Azərbaycan, Gürcüstan və Ermənistanı əhatə edir, hər biri resursdan maksimum istifadə etmək və güclü enerji şəbəkəsi yaratmaq üçün transsərhəd enerji layihələrində fəal iştirak edir (5).

Regional enerji əməkdaşlığının diqqətəlayiq nümunələrindən biri Azərbaycan, Gürcüstan və Türkiyə arasında üçtərəfli tərəfdaşlıqdır. Bu əməkdaşlıq mühüm layihələrin, o cümlədən Bakı-Tbilisi-Ceyhan (BTC) neft kəməri və təbii qaz üçün Cənubi Qafqaz Boru Kəmərinin (CQBK) uğurla həyata keçirilməsi ilə nəticələnib. Bu layihələr təkcə enerji ehtiyatlarının nəqlini asanlaşdırmır, həm də iqtisadi əlaqələri gücləndirir və regional sabitliyə təkan verir.

Cənub Qaz Dəhlizi (CQD) bir çox ölkəni əhatə edən regional enerji əməkdaşlığının daha bir mühüm təzahürüdür. Azərbaycandan Avropaya qədər uzanan SGC-yə Trans-Anadolu Boru Kəməri (TANAP) və Trans-Adriatik Boru Kəməri (TAP) daxildir. Bu bir-birinə bağlı şəbəkə təkcə Avropanın qaz təchizatını diversifikasiya etmir, həm də Cənubi Qafqaz ölkələrinin daha geniş regionun enerji təhlükəsizliyinin təmin edilməsində birgə səylərini nümayiş etdirir.

İkitərəfli və üçtərəfli tərəfdaşlıqdan əlavə, çoxtərəfli təşəbbüslər regional enerji əməkdaşlığına töhfə verir. Bir neçə Cənubi Qafqaz ölkəsini özündə birləşdirən Enerji İcması enerji bazarlarının inteqrasiyasını, infrastrukturun inkişafını və enerji siyasətlərinin uyğunlaşdırılmasını təşviq edir. Bu səylər iqtisadi artımı və sabitliyi gücləndirərək, qüsursuz və bir-biri ilə əlaqəli enerji mənzərəsi yaratmaq məqsədi daşıyır.

Cənubi Qafqazda regional enerji əməkdaşlığı diplomatik dialoqu və qarşılıqlı anlaşmanı əhatə etmək üçün fiziki infrastrukturdan kənara çıxır. Bölgədəki ölkələr enerji təhlükəsizliyi, infrastrukturun inkişafı və ətraf mühitin davamlılığı kimi ümumi problemlərin həllində birgə səylərə səbəb olan paylaşılan resursların və qarşılıqlı asılılığın strateji əhəmiyyətini qəbul edirlər.

Regional enerji əməkdaşlığı çoxsaylı faydalar versə də, problemlər hələ də qalmaqdadır. Geosiyasi gərginliklər, tarixi münaqişələr və fərqli milli maraqlar tərəqqiyə mane ola bilər. Bu çətinliklərə baxmayaraq, əməkdaşlığa davam edən öhdəlik Cənubi Qafqazda enerjinin inkişafına vahid yanaşmanın ümumi faydalarının və uzunmüddətli üstünlüklərinin tanınmasından xəbər verir.

**Geosiyasi təsirlər.**

Cənubi Qafqazda enerji layihələrinin geosiyasi nəticələri regional və qlobal siyasətin dinamikasını formalaşdıran geniş nəticələrə malikdir. Regionun Avropa, Asiya və Yaxın Şərq arasında yerləşən strateji yeri onu enerji oyununda mühüm oyunçuya çevirir. Cənub Qaz Dəhlizi (CQD) və digər əsas infrastruktur layihələri ittifaqlara, asılılıqlara və güc dinamikasına təsir etməklə Cənubi Qafqazın geosiyasi əhəmiyyətini artırır (6).

Əsas geosiyasi təsirlərdən biri enerji təchizatı marşrutlarının şaxələndirilməsidir ki, bu da Avropa dövlətlərinin Rusiya enerji mənbələrindən asılılığını azaldır. Cənub Qaz Dəhlizi TANAP və TAP kimi boru kəmərləri ilə Xəzər və Mərkəzi Asiya qazının Avropaya çatdırılması üçün alternativ marşrut yaradır. Bu, Rusiyanın Avropaya enerji təchizatı marşrutları üzərində monopoliyasını azaldır və bununla da Rusiyanın ənənəvi olaraq saxladığı geosiyasi təsir rıçaqlarını dəyişdirir.

Bundan əlavə, Cənubi Qafqaz enerji layihələri yeni ittifaqlar və tərəfdaşlıqları gücləndirir. Azərbaycan əsas enerji ixracatçısı kimi BTC boru kəməri kimi layihələr vasitəsilə Türkiyə və Qərb dövlətləri ilə əlaqələri gücləndirib. Bu ittifaqlar təkcə enerji tranzit marşrutlarının təhlükəsizliyini təmin etmir, həm də regional sabitliyə və qlobal siyasətə təsir edən geosiyasi uyğunlaşmalar yaradır.

Digər tərəfdən, enerji layihələri həm də geosiyasi gərginliyin potensial sahələrini təqdim edir. Rusiya və İran da daxil olmaqla regional güclər arasında rəqabətli maraqlar nəzarət, giriş və təsir üzərində mübahisələrdə özünü göstərə bilər. Cənubi Qafqaz, Avrasiyanın enerji landşaftında hökmranlıq uğrunda daha geniş mübarizəni əks etdirən, rəqabət aparan geosiyasi istəklər üçün döyüş meydanına çevrilir (Baxşəliyev, 2021: 1-3).

Cənubi Qafqazda həyata keçirilən enerji layihələri region ölkələri arasında münasibətlərə də təsir edir. Enerji infrastrukturu üzrə əməkdaşlıq qarşılıqlı fayda gətirsə də, mövcud siyasi və etnik gərginliyi daha da gücləndirə bilər. Boru kəmərlərinin mürəkkəb şəbəkəsi diplomatik incəlik və münaqişələrin həlli mexanizmlərinə ehtiyacı vurğulayaraq mübahisə mənbəyinə çevrilə bilər.

Bundan əlavə, Cənubi Qafqaz enerji layihələri Rusiya enerjisindən asılılığını azaltmaq istəyən Avropa ölkələrinin geosiyasi hesablamalarına təsir göstərir. Regiondan keçən alternativ marşrutların inkişafı Avropa dövlətlərinin enerji təhlükəsizliyini artırır və Rusiya ilə siyasi gərginlikdən irəli gələn zəiflikləri azaldır.

**Enerji Tranziti Marşrutları və Dəhlizləri.**

Cənubi Qafqazda enerji tranzit marşrutları və dəhlizləri enerji resurslarının istehsalçı ölkələrdən istehlak bazarlarına hərəkətinin asanlaşdırılmasında mühüm rol oynayır. Regionun əsas enerji istehsal edən ölkələr və yüksək tələbatlı istehlak bazarları arasında strateji yerləşməsi onu müxtəlif enerji mənbələri üçün əsas tranzit mərkəzinə çevirərək, iqtisadi və geosiyasi dinamikanı formalaşdırıb (Brüsseldə Azərbaycan-Avropa İttifaqı Əməkdaşlıq Şurasının 17-ci iclası keçirilib", 2020: 2).

Cənub Qaz Dəhlizi (CQD) Cənubi Qafqazda mühüm enerji tranziti marşrutu kimi seçilir. Trans-Anadolu Boru Kəməri (TANAP) və Trans-Adriatik Boru Kəməri (TAP) kimi boru kəmərlərindən ibarət olan SGC Xəzər dənizindən təbii qazın Avropa bazarlarına çıxmasına imkan verir. Bu, təkcə Avropanın qaz təchizatını şaxələndirmir, həm də onun ənənəvi marşrutlardan asılılığını azaldır, enerji təhlükəsizliyini artırır və regionda geosiyasi tarazlığa töhfə verir.

Bakı-Tbilisi-Ceyhan (BTC) neft kəməri Cənubi Qafqazda Xəzər dənizini Aralıq dənizi ilə birləşdirən digər mühüm enerji tranzit dəhlizidir. Bu boru kəməri Qara dənizdən keçən ənənəvi marşrutlardan yan keçərək neft ixracı üçün alternativ yol təqdim edir. BTC boru kəməri nəql variantlarını şaxələndirməklə regional sabitliyə töhfə verir və geosiyasi gərginliyin enerji tranzitinə təsirini azaldır.

Cənubi Qafqaz həm də region ölkələrini birləşdirən bir-birinə bağlı elektrik şəbəkələri ilə elektrik enerjisinin nəqlində mərkəzi yer tutur. Bu, enerji resurslarının mübadiləsini asanlaşdırır,

